Məndən böyüklər ata-anam, həmyaşıdlarım qardaşım-bacım, məndən kiçiklər isə oğlum və qızım yerindədir.

***Hacı Əli Ayaz Sobulu***

Ədalətli atanın ədalətli övladı və ədalətli övladın da atası olmaq ən böyük xöşbəxtlikdi.

***Hacı Əli Ayaz Sobulu***

Hacı Əli Ayaz Sobulu
ZƏNGİLAN ŞƏHƏRİNİN MƏKTƏB MƏHƏLLƏSİ
Bakı, «Zərdabi Nəşr» MMC, 2024, 112+16 səh.

Kitabda Zəngilan şəhərinin Ermənistan respublikasının silahlı qüvvələrinin rayonun işğalından qabaq mövcud olmuş məktəb məhəlləsinin qisməndə olsa tarixi və oradakı əhalinin həyat və fəaliyyətinin araşdırılmasına cəhd edilmişdir.

Üz qabığında Zəngilan şəhər 1 saylı orta məktəbin işğaldan əvvəlki şəkli, arxada isə şəhərin qarşısındakı təpədən Zəngilan şəhərinin işğaldan sonrakı vəziyyətini əks etdirən foto verilib.

# Kitabın içindəkilər

## Müəllifdən

Hər bir insana doqulduqu yer, vətəni əzizdi. Vətən dedikdə mən nəyi nəzərdə tuturam. Mənim üçün vətən əvvəl mənim doğulduğum ev, sonra mənim kəndim, sonra isə Zəngilan və Azərbaycan deməkdir. Sonra isə daha geniş mənada mənim üçün vətən anlayışı yer kürəsidi.

Artıq mənim üçün o kiçik ev, kənd və Zəngilan əlçatmaz oldu. Düsündüm ki, heç olmasa uşaqlıq və gəncliyimin keçdiyi o məhəllədən nə isə bəzi şeyləri yazım. Mən həyatı bu küçədə, bu məhəllədə anladım. İnsan həyatında bu önəmli dövrdü. Məhəlləmiz 28 aprel küçəsi adı ilə tanınırdı. 28 apreli, Sovetlərin Azərbaycanı işğal etdiyi günü biz sovet zamanında bir bayram kimi qeyd edərdik. O zaman deyilirdi ki, sovet hökuməti bizi istismarçılardan xilas edib.

Sovet hökumətinin süqutundan sonra küçəmizin adı dəyişdirilərək 28 may adlandırıldı. Bu tarix isə şərqdə ilk demokratik Respublikanın qurulduğu gündür ki, biz indi bunu «Respublika günü» kimi qeyd edirik.

70- ci illərə kimi suvarma kanalının alt hissəsi də 28 aprel küçəsi hesab olunurdu. Sonralar kanalın alt hissəsinə 26 Bakı komissarlarından biri olan Məşədi Əzizbəyovun (06.01.1876, Bakı -20.09.1918, Krasnovodsk) adını verdilər və beləliklə məhəlləmiz iki yerə bölündü.

Bu küçədə şəhərimizin ilk məktəbi, ilk futbol stadionu, ilk kino klub, ilk yay kino klubu inşa olunub. Şəhərimizin ən böyük parkı hansı ki, o zamanlar V.İ.Leninin adını daşıyırdı o da bizim küçənin qərb hissəsində yerləşirdi.

Şəhərimizin ilk Su Elektrik Stansiyası da bizim küçənin cənub-şərq hissəsində tikilmişdi. SES-si işlədən kanal da bizim küçədən keçirdi. Mingəçevir şəhərindən elektrik enerjisi verilməyə başlayanda yerli SES-lər ləğv olundu. SES ləğv olunsa da bu kanal sonralar suvarma kanalı kimi rayonun işğalına kimi işlədi.

# MƏHƏLLƏDƏKİ İCTİMAİ BİNALAR

## Pirçivan kəndinin ilk məktəb binası

İndiki Zəngilan şəhərinin əvvəl adı Pirçivan olub. Mənası Pir olan yer deməkdir. Sovet hakimiyyətinin ilk illərində geniş əkin sahələrinə malik bir kənd olan Pirçivan sonralar Azərbaycanda sovet hakimiyyəti qurulandan sonra sürətlə böyümüş və 1930–cu ildə rayonlaşma zamanı Zəngilan rayonunun mərkəzi təsdiq edilmişdir. Burada əsrin əvvəllərində əsasən bəylərin malikanələri və fərdi evləri var idi. Kəndin ən qədim ictimai binası Məscid idi. Sovet hakimiyyəti illərində dini ibadət yeri kimi istifadə edilməyən Məscid uzun illər ticarət obyekti kimi istifadə olunmuşdur. Məscidin Orta Əsrlərdə tikildiyi deyilir. Onun qapısı günçıxana baxırdı və tağbəndin üst tərəfində ərəb əlifbası ilə bir kitabə var idi.

1929- ci ildə Pirçivanda açılan 7 illik məktəb, **1938**-ci ildə orta məktəbə çevrilmişdir. İlk dövrlərdə məktəb Məsciddə fəaliyyətə başlayıb. Sonralar orta məktəbə çevrilən bu təhsil ocağı rayonun əsas təhsil bazası olmuşdur. Məktəbin mövcud olduğu 64 il ərzində on minlərlə məzunu olub. Onun son direktoru isə Arif Abdulla oğlu Əhmədov olmuşdur. Məktəbin direktorlarından Təhməzov Ziyad Murad oğlu tarix elmləri namizədi, Əliyev Nəriman Salman oğlu isə filologiya elmləri namizədi alimlik dərəcəsi adı almışdır. Həmin məktəb də bizim məhəllədə açılmış və sonra onun üçün xüsusi məktəb binası (şəhərimizin ilk məktəb binası) tikilmişdir. İşğal zamanı həmin binada 2 saylı şəhər orta məktəbi fəaliyyət göstərirdi. 1893-cü ilin məlumatına görə Pirçivanda 50 tüstü (ev) və 211 nəfər əhali olub. Onlardan 121-i kişi, 90 nəfəri isə qadındı. Həmin dövrdə isə Malatkeşin kəndində 115 tüstü və 565 (315,250) nəfər əhali olub.

**Bax: Свод статистических данных о населении Закавказскаго края, извлеченных из посемейных списков 1886 г. [Текст] / издан по распоряжению Главноначальствующаго гражданскою частию на Кавказе Закавказским статистическим комитетом. - Тифлис : Тип. И. Мартиросиянца, 1893. - XV, [899], 52 с. : табл.; 26 см.**



**İlk orta məktəbin yeni binası**



**Zəngilan şəhər 1 saylı orta məktəbin müəllimlərindən. Soldan sağa**: Hüseynov Abbas, Həsənov Əyyub, Əhmədov Abdulla, Yağışov Sehran, Atakişiyev Seyfət, Səfərov İskəndər, Əsədov Əbil, Şıxəliyev Firudin, Qocayev Səməd, İsmayılov Eldar, Cəfərov Səfər (ayaq üstə duranlar), Qafarov Məmməd, Hüseynova Sona, Təhməzov Ziyad, Əliyev Nəriman, Ağayev Nəriman, Hacıyev Tofiq, Nəsibov Ziyad, Məmmədov Əsəd, Nəsirov Cəlal.

Buradan aydın görünür ki, Pirçivan rayon mərkəzi kimi təsdiq olunandan sonra nə qədər böyüyüb. İşğal ərəfəsində şəhərin əhalisi təxminən 9 min nəfər olub. Yüz il (1893-1993) ərzində Pirçivanın əhalisi 211 nəfərdən 9 minə çatıb

1964-cü ildə isə qəsəbə stadionunun yerində məktəb üçün iki mərtəbəli, fənn kabinələri və idman zalı olan yeni bina inşa edilməyə başladı.

## Zəngilan qəsəbə stadionu

Şəhərimizin ilk futbol stadionu da bizim küçədə idi. Mənim 5-6 yaşım olanda burada Zəngilan və Mincivan komandalarının oyununu görmüşəm. O dövrdə Zəngilan qəsəbə idi. Komandamızın adı **«Spartak»**, Mincivan komandası isə **«Araz»** adlanırdı. O vaxt futbol oynayanların bəzilərini böyüyəndə tanıdım və hətta bəziləri ilə bir yerdə işləməli oldum. Mincivan komandasında mənim rəhmətlik qohumum Hidayət də oynayırdı. Fasilə zamanı bütün komanda ilə o bizə gəlib su içərdilər. Mən o zaman Əmiri,




**Pirçivan kəndinin ilk stadionu**

Əli Quliyevi və sair gördüm. Mənə elə gəlir ki Azərbaycanın kənd rayonları arasında bizim «Səməd Vurğun» adına stadion sahəsinə görə ən böyük meydança idi. Burada 55 il əvvəl gördüyüm oyunçulardan yadımda qalanları qeyd edirəm.

Rəsulov Əlibayram, Bayramov Sahmar, Bəsirov Arif, Fərəcov Rasif, Alagöz (Nəriman Ağayev), Allahverdiyev Əli və Bəhmən qardasları, Məhərrəmov Abdulla, Şükürov Alməmməd və sair.

## İlk bazarlardan biri

Pirçivanın ilk bazarlarından biri bizim məhəllədə idi. Bunu deməyə o əsas verir ki, təxminən 1961-62-ci ildə burada suvarma kanalının sol tərəfində bazar hələ də işləyirdi. Bazarkom isə Əliş adlı birisi idi. Sonralar buradakı bazarı sökdülər. Həmin bazarın yerində işğal ərəfəsində İbrahimov Vahid Qasım oğlunun evi var idi.

## İlk qəbiristanlıq

Pirçivanın ilk qəbristanlıqlarından biri də bu ərazidə olub. 60-cı illərdə suvarma kanalının sol hissəsində bazar inşa edilən zaman buradan insan skeletlərinin çıxdığını gördüm. Bu onu deməyə əsas verir ki, burada Pirçivanın ilk qəbristanlıqlarından biri olub. Bu qəbiristanlıq köhnə Pirçivan ərazisində olan və 80-ci illərdə bağlanan qəbiristanlıqdan çox qədimdir. Óla bilsin burada bəylərin nökər və qulluqçuları dəfn olunub. Burada bazar inşa edən zaman heç bir qəbirüstü abidə yox idi.

## Rayonun ilk kino klubu

Qəsəbənin ilk kino klubu da bu məhəllədə idi. Ilk dəfə mən və yaşıdlarım bu binada bədii filmə baxmışıq. O xoş anlar yadıma düşəndə kövrəlirəm. Klubun direktorlarından Qara Zamanovu,

Əvəz Salmanovu, Hürü Mehralıyevanı, Dilarə İsmayılovanı, Asif Bağırovu qeyd edərdim. Kino mexanik isə Arif Bəşirov idi. O eyni zamanda yaxşı futbol da oynayırdı.

## Yay klubu

Qəsəbənin yay klubu da burada idi. Burada da dəfələrlə film və konsetrlərə baxdığımı xatırlayanda gözlərim dolur. Mən burada sonuncu dəfə tarzən Həbib Bayramovun rəhbərliyi ilə Tükəzban İsmayılovanın konsertinə baxmışam. Allah hər iki sənətkara rəhmət eləsin.

## Tarix-diyarşünaslıq muzeyi

70-ci illərdə sovet hökümətinin qərarı ilə bütün rayonlarada Tarix-Diyarşünaslıq müzeyləri açıldı. Zəngilan rayonunda muzey 1980-ci ildə açıldı. Oktyabr küçəsində yerləşən və əvvəllər kitab mağazası kimi istifadə olunan bina muzey üçün ayrıldı. Tariximizi əks etdirən minlərlə eksponatı olan bu muzey də bizim məhəllədə yerləşirdi. Muzeyin ilk direktoru rəhmətlik Alməmməd Məhəmməd oğlu Kərimov idi.

Mən Bakıdan rayona qayıdanda bir neçə ay işsiz qaldım. O zaman rayonumuzda zəlzələ baş verdiyindən Bakıdan gələn komissiya evləri gəzib zərəri qiymətləndirirdi. Bizə rayondan bir nümayəndə ilə bir nəfər gəlmişdi. Evlərə baxandan sonra bəzi şeylərlə maraqlandı. Mənə nə işlə məşğulsan dedi. Mən də hələlik işləmədiyimi dedim. Dedi bir sənətin varmı? Dedim ki, Universitetin tarix fakültəsini bitirmişəm.

Bu söhbətdən sonra günlərin bir günü muzeyin işçilərindən bir bizə gəlib dedi:

-Səni Alməmməd müəllim çağırır.

Təəccüb elədim. Mənin onunla şəxsi tanışlığım yox idi. Getdim onunla görüşdüm. Söhbət zamanı mənə belə dedi:

-Bizdə bir ştat boşalıb. Eşitmişəm ki, sən də tarix fakültəsini bitirmisən. Get raykoma gör versələr gəl bərabər işləyək. Mən orada işləmək istəsəm də alınmadı.

Sonra öyrəndim ki, bizə gələn həmin qonaq müzeyə gedib və mənim işsiz olduğumu bildirib.

Təhsil şöbəsi, rayon şahmat məktəbi, musiqi məktəbi də bizim məhəllədə idi.




**Zəngilan şəhərinin bir hissəsi**

# MƏHƏLLƏNİN SAKİNLƏRİ

## Həsənov Hüseyn Həsən oğlu



Həsənov Hüseyn Həsən oğlu 1910-cu ildə rayonun Üdgün kəndində anadan olub. Sonralar rayon mərkəzinə köçüb. Hüseyn dayı rayonun müxtəlif idarələrində fəhlə kimi çalışmış, ömrünün son illərində isə rayon Maliyyə şöbəsində gözətçi işləmişdir. Həsənov Hüseyn Həsən oğlu rayonun işğalından əvvəl vəfat etmişdir.

## Əhmədova Telli İbiş qızı



Əhmədova Telli İbiş qızı 1924-cü ildə Beşdəli kəndində adadan olub. Telli xala evdar qadındır. Onların iki oğlu və iki qızı var. Telli xala 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.




Rayonun işğalından sonra 11 sentyabr 2009-cu ildə Bakı şəhərində vəfat etmişdir. Sonralar öyrəndim ki, Telli xala uşaq vaxtı mənə öz südündən verib, yəni mənim süd anam olub.

## Əsgərov Eldar Qulam oğlu



Əsgərov Eldar Qulam oğlu 07 Iyul 1941-ci ildə anadan olub. O məhəllənin ən sakit və mədəni insanlarındandı. Telli xalanın ilk övladıdır. Eldarın atası Əsgərov Qulam Məhərrəm oğlu 1941-1945-ci illər müharibəsindən qayıtmayıb. Eldar 1960-1963-cü illərdə Leninqrad vilayətində hərbi xidmət keçib. Hərbi xidmətdən sonra rayona gələn Eldar düz 51 il tikinti-təmir idarəsində çalışıb. Bu idarə şəhərimizin abadlıq işləri ilə məşğul idi. Şəhərimizin qurulmasında və abadlaşdırılmasında Eldarın da az əməyi olmayıb. Eldarın yoldaşı İsmayılova Mədinə Həsən qızı 1941-ci ildə anadan olub.

Onların Təyyar (1967), Zahir (1968), Zakif (1971) adlı oğlanları və Təranə adlı qızları var.

## Həsənov Mürvət Hüseyn oğlu



Həsənov Mürvət Hüseyn oğlu 24 may 1953-cü ildə Pirçivan kəndində anadan olub, 1971-ci ildə şəhər orta məktəbini, sonra isə Bakı Politexnik Texnikumunu bitirmiş, rayonda SU-33, SU-65 və SU-13 adlı tikinti idarələrində iş icraçısı olmuşdur. 1991-ci ildən isə rayonun işğalına kimi 13 saylı tikinti idarəsinin müdiri işləyib.

Yoldaşı Hüseynova Nərgiz Müzəffər qızı əslən Mincivan qəsəbəsindəndi. Onlar 1979–cu ildə evlənmişlər və Hüseyn (uşaqları Arda, Aysu), Elnarə (uşaqları-Nihad, Məhəmməd) və Elnur (uşaqları-Mürvət, Həsən) adında üç övladları var.

**Mədinə** Hüseyn qızı 10 sentyabr 1956-cı ildə Pirçivan kəndində anadan olub. 1973-cü ildə şəhər orta məktəbini bitirib.

Yoldaşı Gülağa əslən Beşdəli kəndindəndir. Onların Vüsal, Coşqun və Hürzad adlı 3 qızı var.

**Şəhrux Hüseyn oğlu** 01 aprel 1964-cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1981-ci ildə şəhər orta məktəbini, sonra isə sürücülük kursunu bitirib. Rayonun işğalı ərəfəsində RIC- də sürucu işləyirdi.

Yoldaşı Məmmədova Gülgəz Atlıxan qızı 15 noyabr 1968-ci ildə Beşdəli kəndində anadan olub.. Onların Telli (uşaqları-İsmayıl, İsaq), Samirə (uşaqları-Zülfüqar, Yusif), Fərqanə adında qızları, Murad adlı oğlu var.

**Qəndili Hüseyn qızı** 11 may 1960-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1977-ci ildə şəhər orta məktəbini bitirib. Onun Əhməd (uşaqları-Abbas, İsmayıl), Səkinə (uşaqları-Müşfiq, Səbinə) adında iki övladı var.

## Bağırov Hidayət Məmiş oğlu



**Bağırov Hidayət Məmiş oğlu** 1932-ci ildə rayonun füsunkar güşələrindən biri olan Keçikli kəndində anadan olub. Atası Bağırov Məmiş Məhəmməd oğlu 1941-1945-ci illər müharibəsində iştirak etmiş və Kenisberq (indiki Kaliningrad) şəhəri uğrunda gedən döyüşlərdə həlak olmuşdur.

Bağırov Hidayət Məmiş oğlu 1956-cı ildə Gəncə şəhərindəki Azərbaycan Kənd Təsərrüfatı İnstitutunu bitirib. Elə həmin tarixdən də Zəngilanda müxtəlif vəzifələrdə çalışıb. Sonralar Hidayət Bağırov Sumqayıt şəhərinə köçdü. Onların evində anası Şəndə xala yaşayırdı.

Hidayət Bağırova 1993-cü ilin Oktyabır 27-də Zəngilanın işğalı xəbəri çatanda halı daha da pisləşmiş və bir həftə sonra vəfat etmişdir.

*Hidayət Bağırovla bağlı bir məsələni qeyd edəcəyəm. Anam həmişə ondan razılıq edərdi. Çoxlarınız bilir ki, əvvəllər şəhərimizdə də bəzi ailələrə ipək qurdu saxlatdırardılar. Bizə də hər il bu verilirdi. Çox gəlirli sahə olsa da əziyyəti də çoxdur. Anam xəstə olduğundan onu becərə bilmirdi. Qurd toxumlarını anam götürməyəndə atamı milisə çağırıb qorxudaraq yenə vermişdilər. Anam bu işdən qurtulmaq üçün Hidayət Bağırovdan ona kömək göstərməsini xahiş edir. Onu da qeyd edim ki, o illərdə Hidayət Bağırov rayon mərkəzindəki kolxozün sədri idi. Anam da onun yoldaşı Əzət (o əslən Sobuludu) xanıma arxalanaraq ondan bu xahişi etmiş, o rəhmətlik də anama kömək edərək onun adını ipək qurdu saxlayanların siyahısından silmişdi.

## Bağırova Əzət Qulu qızı



Həyat yoldaşı Bağırova Əzət Qulu qızı 1936-cı ilin iyun ayında rayonun digər bir füsunkar təbiəti olan Sobu kəndində anadan olub. Gəngə şəhərində Tibb Texnikumunu bitirən Əzət xanım əmək fəaliyyətinə Zəngilan rayon Mərkəzi xəstəxanasında başlayıb. 2015-ci ilin fevral ayınınn 17- də vəfat etmişdir. Erkən yaşlarından atasını itirən Əzət xanımı əmisi böyüdüb. Hidayət Bağırovla Əzət xanımın üç oğlu, bir qızı var. Hamısı ali təhsil almışlar.

-oğlu **Ədalət** 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1974-cü ildə Zəngilan şəhər orta məktəbini bitirib.

-oğlu **Sabir** 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1976-cı ildə Zəngilan şəhər orta məktəbini bitirib.

-oğlu **Zahid** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1979-cü ildə Zəngilan şəhər orta məktəbini bitirib.

-qızı **Şəhla** 1964-cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1981-ci ildə Zəngilan şəhər orta məktəbini bitirib.

İndi bu ailələrdə balaca Hidayət, Əzət və başqaları böyüyür.

## Mahmud kişi və Nəniş xala



Mahmud kişi əslən Qubadlı rayonundandır. Onlar əvvəl Məscid məhəlləsində yaşayıb.. Sonra bizim məhəllədə torpaq sahəsi almış və ev tikmişlər. Yoldaşı Məmmədquliyeva Nəniş Şükür qızıdı. Mahmud kişi işğaldan əvvəl şəhərimizdə vəfat edib. Onların Əbil adında bir oğlu var idi. 70-ci illərdə Əbil Sumqayıta köçdü. İşğal zamanı evdə Nəniş xala yaşayırdı. Təxminən 1944-cü il təvəllüdlü olan Əbil də dünyasını dəyişib.

## Cəfərov Məhəmməd Qədir oğlu

Cəfərov Məhəmməd Qədir oğlu 1900-cu ildə rayonun Bürünlü kəndində anadan olub. Müharibədən sonra Pirçivana köçüb. Müharibə veteranı idi. 1980-ci ildə Zəngilan şəhərində vəfat edib. Yoldaşı Cəfərova Gülcahan İskəndər qızı 1907-ci ildə anadan olub. və 1974- cü ildə vəfat edib.. Onlarin bir qızı, iki oğlu var.

-oğlu Rəşid 1930-cu ildə Bürünlü kəndində anadan olub. Mincivanda yaşayan  Rəşid Cəfərov 1997-ci ildə vəfat edib.

## Cəfərova Dilarə Məhəmməd qızı



-qızı Cəfərova Dilarə Məhəmməd qızı 1936-cı ildə Bürünlü kəndində anadan olub. O bizim məhəllədə olan klubda işləyirdi. Dilarə xanım 1993-cü ildə vəfat etmişdir. Onun Əşrəf adlı bir oğlu var. İsmayılov Əşrəf Həsən oğlu 1961-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Rayonda sürücü işləmişdir. Hal-hazırda təqaüddədir

## Cəfərov Aydın Məhəmməd oğlu



Cəfərov Aydın Məhəmməd oğlu 1941-ci ildə Bürünlü kəndində anadan olub. 1960-cı ildə Zəngilan qəsəbə orta məktəbini bitirmiş və bir il həmin məktəbdə kargüzar işləmişdir. 1961-1964-cü illərdə Bakı şəhərində DİN-nin hərbi hissələrindən birində hərbi xidmət keçmişdir. Ordudan tərxis olunandan sonra 1965-ci ilin yanvarından avqust ayına kimi rayonda nəşr olunan «Kənd həyatı» qəzeti redaksiyasında yerli radio verilişlərinin aparıcısı olub. Sonra Aydın Cəfərov 1965-1970-ci illərdə Azərbaycan Xarici Dillər İnstitutunun rus dili və ədəbiyyatı fakültəsində oxumuşdur. Ali məktəbi bitirdikdən sonra Rayona gəlmiş və Malatkeşin kənd 8 illik məktəbində ixtisası üzrə müəllim işləmişdir. 1972-ci ildə isə rayon Təhsil şöbəsində metodist işləmiş və eyni zamanda da şəhər orta məktəbində ixtisası üzrə dərs demişdir.

## Sadıqova Gülşən Zeyqəm qızı



Yoldaşı Sadıqova Gülşən Zeyqəm qızı 1952-ci ildə rayonun Malatkeşin kəndində anadan olub. Ticarət məktəbini bitirən Gülşən xanım şəhərimizdəki ərzaq mağazalardan birində satıcı işləyirdi. Sadıqova Gülşən Zeyqəm qızı 2017-ci ilin 11 fevralında vəfat etmişdir. Onların iki qızı, bir oğlu var.

-oğlu **Nəsimi** 1975-ci ildə Zəngilan şəhərində anadan olub. Orta məktəbi bitirdikdən sonra hərbi xidmət keçən Nəsimi sonra DİN-sistemində işə qəbul olub. Yoldaşı Ağayeva Hökümə dir. Onların iki qızı var. Gülşən və Leyla.

-qızı **Məhsəti** 1976-cı ildə Zəngilan şəhərində anadan olub. Azərbaycan Pedaqoji İnstitutunun Riyaziyyat fakültəsini bitirən Məhsəti xanım Ceyranbatan qəsəbəsindəki 1 saylı tam orta məktəbdə ixtisası üzrə işləyir. Yoldaşı Rüstəmov Ziya Zəngilanlıdır. Onların Nigar adlı bir qızı. Nihad adlı bir oğlu var.

-qızı **Natəvan** 1978-ci ildə Zəngilan şəhərində anadan olub. Natəvan Azərbaycan Pedaqoji İnstitutunun dil-ədəbiyyat fakültəsini bitirib və hal-hazırda Ceyranbatan qəsəbəsindəki 1 saylı tam orta məktəbdə ixtisası üzrə dərs deyir. Həyat yoldaşı Mətləb rayonun Vənətli kəndindəndir. Onların Zəhra adlı bir qızı var.

## Vəliyev Qasım Eyvaz oğlu



Vəliyev Qasım Eyvaz oğlu 01 may 1929-cu ildə rayonun Qıraq Müşlan kəndində anadan olub. Bakı Maliyyə Texnikumunu bitirdikdən sonra rayona qayıtmış əvvəlcə Aqrar-Sənaye Bankında sonralar isə SU-33, Avtobaza və s idarələrdə mühasib işləmişdir. Qasım dayı Zəngilan Rayon İcraiyyə Komitəsinin ilk katibi Eyvaz Vəliyevin oğludur. İşğaldan əvvəl 03 oktyabr 1981-ci ildə vəfat etmişdir.

## Kərimova Rüqiyyə Cabbar qızı



Yoldaşı Kərimova Rüqiyyə Cabbar qızı 1940-cı ildə anadan olub. Naxçıvan Pedaqoji Texnikumunu bitirən Ruqiyyə müəllimə uzun illər 1 saylı şəhər orta məktəbində dərs deyib.



Onların bir oğlu, 4 qızı var.

Ruqiyyə müəllimə 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.

-qızı **Adilə** 08 aprel 1960-cı ildə Zəngilan qəsəbəsində anadan olub, 1977-ci ildə şəhər orta məktəbini bitirib. Sonra 1979-1984-cü illərdə Azərbaycan Pedaqoji İnstitutunun ibtidai sinif müəllimi fakültəsini bitirib. Yoldaşı Bağırov İlqar Habil oğludur Onların Zeynəb adlı bir qızı var.

-qızı **Südabə** 05 noyabr 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub, subaydır. 1979-cu ildə şəhər orta məktəbini, 1984 cü ildə Texnologiya Texnikumunu bitirib.

-oğlu **Hikmət** 10 aprel 1964- cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1981-ci ildə şəhər 1 saylı şəhər orta məktəbini, 1994 cü ildə Tula Dövlət Texniki Universitetini bitirib. Yoldaşı Cəfərova Səlbinaz Telman qızı 24 avqust 1975-ci ildə anadan olub. O 2 saylı Tibb Texnikumunu bitirib. Onların Leyla, Qasım, Namaz və Eyvaz adlı dörd övladı var. İki sonuncular əkizdir.



-qızı **Aidə** 28 mart 1966-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1983-cü ildə şəhər 1 saylı orta məktəbin, sonra isə Bakı Mühasibat-Uçot Texnikumunu bitirib. 14 aprel 1999-cu ildə vəfat etmişdir. Yoldaşı Abasov Mübariz Talıb oğludur. Onların Nisə və Ruslan adlında iki övladı var.

-qızı **Səidə** 26 iyun 1968-ci ildə Zəngilan şəhərində anadan olub. 1985-ci ildə şəhər 1 saylı orta məktəbini, sonra da Bakı Pedaqoji Sənaye Texnikumunu bitirib. Yoldaşı Cəlilov Rafiq Vahid oğludur. (Ağdaşdan). Onların Aygün, Gülnaz və Elvin adında üç övladı var..

## Əliyev Həmid Hadı oğlu



Əliyev Həmid Hadı oğlu 1905-ci ildə Zəngilan rayonunun Seyidlər kəndində anadan olub. O məhəlləmizin ən yaşlılarndan hesab olunurdu. Sakit adam idi kimsə ilə işi olmazdı. Onun mən qonşuluqda kimsə ilə mübahisə etdiyini görmədim. İsğal ərəfəsində rayon toxumçuluq idarəsində aqronom idi. İşğaldan sonra 2005-ci ildə Bakı şəhərində vəfat ertmişdir.

## Piriyeva Diliş Hüseynalı qızı



Yoldaşı Piriyeva Diliş Hüseynalı qızı rayonda orta məktəbdə xidmətçi işləyib.. O da işğaldan sonra 2002-ci ildə Bakı şəhərinə vəfat etmişdir. Piriyeva  Diliş Hüseynalı qızı 7 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli «Analıq Şərəfi» Ordeni ilə təltif olunub.




Onların 4 oğlu və 3 qızı var.



-oğlu Yusif 1950-ci ildə Pirçivan kəndində anadan olub. 1957-1967-ci illərdə orta məktəbdə oxuyub. Orta məktəbi bitirdikdən sonra mühasiblik kursunu bitirmişdir. Rayonda mühasib işləyirdi. Yusifin yaxşı qəzəl söylədiyini eşitmişəm.  Subay idi.

Əliyev Yusif Həmid oğlu İşğaldan sonra avqust 2018-ci ildə Bakı şəhərində vəfat etmişdir

-qızı Nisə 1953-cü ildə Pirçivan kəndində anadan olub. 1969-cu ildə Zəngilan qəsəbə orta məktəbin 8-ci sinfini bitirib. Sonra oxumağa getmiş və başqa rayonda köçüb. Yoldaşı Yaqub Daşkəsən rayonundandı. Onların Əfsanə, Sahib, Rahib, Səlim adlı oğlu, Yeganə adlı qızı var. Nisə 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli «Analıq Medalı» ilə təltif olunub.



-qızı Nigar 1955-cü ildə Pirçivan kəndində anadan olub. Orta məktəbin 9-cu sinifində oxuyarkən 1970-ci ilin sentyabr ayının əvvəllərində qəflətən vəfat edib. Çox gözəl idi. Onunla bir sinifdə oxumuş Rafiq Heydərov deyir ki, pambıq yığımı zamanı bütün qızlar mahnı oxuyardı. Nigarın səsi  daha güclü və ürəyə yatımlı idi. Allah rətmət eləsin.

-qızı Mirvari 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1974-cü ildə şəhər orta məktəbini bitirib. Yoldaşı Əhməd  Qıraq Müşülanlıdı..

-oğlu Bəxtiyar 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1976-cı ildə orta məktəbi bitirib. Sürücü işləyirdi. Yoldaşı Ramilə Mincivandandı. Onların Sima (qızı Lara), Günel (qızı Aytac), və Elvin (oğlu Bəxtiyar) adında üç övladı var.

-oğlu Vahid 1963-cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1977-ci ildə orta məktəbi bitirib. Yoldaşı Beşdəli kəndindəndi. Onların Samir və Sevinc adlı iki övladı var.

-oğlu Saleh 1969-cu ildə Zəngilan şəhərində anadan olub. 1986-cı ildə  orta məktəbi bitirib. İşğaldan sonra evlənib. Yoldaşı Dürdanə Şəkilidi. Onların Ruslan və Səma adlı iki övladı var.

## Tacəddin kişi

Tacəddin kişi Əslən Seyidlər kəndindəndir. Məhəllənin ən yaşlı sakinlərindən idi. Onların iki oğlu var. Böyük oğlu **Şərifov Niftalı** Tacəddin oğlu məhəllənin başqa hissəsində yaşayırdı.

## Şərifov Fehruz Tacəddin oğlu



Şərifov Fehruz Tacəddin oğlu 16 mart 1936-cı ildə rayonun Seyidlər kəndində anadan olub. Zəngilan qəsəbəsində orta məktəbi bitirdikdən sonra o Azərbaycan Politexnik İnstitutunu bitirmişdir. İşğal ərəfəsinə həmin evin ailə başçısı idi. Şərifov Fehruz Tacəddin oğlu işğaldan əvvəl rayon toxuculuq kombinatında işləyirdi. Toxuculuq sexini Fehrüz təşkil elədi, açdı. Elə ki, hər şey hazır oldu və istehsala başlayanda onu işdən kənarlaşdırıb başqasını sexə rəis təyin etdilər. İşğaldan sonra Bakı şəhərində məskunlaşmış, 2021-ci ildə vəfat etmişdir.

## Məhərrəmova Gülüzar Qaytaran qızı



Yoldaşı Məhərrəmova Gülüzar Qaytaran qızı 05 sentybr 1952-ci ildə rayonun İçəri Müşlan kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra o Azərbaycan XT İnstitutunu da bitirib. İşğaldan əvvəl Rayon İstehlak Cəmiyyətinin qarajında mühasib işləyib. Onların iki oğlu, bir qızı var.

**-oğlu İlqar** 25 oktyabr 1974-cü ildə Zəngilan şəhərində anadan olub. 8 sinfi bitirdikdən sonra Bakıya getmiş Ceyranbatan qəsəbəsindəki 147-saylı Texniki PM-də oxuyub. Hal-hazırda sürücü kimi çalışır.

-qızı **İlhamə** 04 iyun 1976- cı ildə Zəngilan şəhərində anadan olub, 1993-cü ildə şəhər 1 saylı orta məktəbini, sonra da Tibb Texnikumunu bitirib.

**-oğlu Anar** 05 may 1979-cu ildə Zəngilan şəhərində anadan olub. Hal-hazırda sürücü işləyir.

## Cəfərov Səfiyar Cəfər oğlu



Cəfərov Səfiyar Cəfər oğlu 1926-cı ildə rayonun Qıraq Müşlan kəndində anadan olub. Sonra rayon mərkəzinə köçmüşdür. Rayon tikinti təmir idarəsində suvaqcı-rəngsaz işləyirdi. Yaxşı işinə görə şəkli rayonun şərəf lövhəsinə vurulmuşdu. İşğaldan sonra 17 noyabr 1997-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## İmanova Püstə Xudaverdi qızı



Yoldaşı İmanova Püstə Xudaverdi qızı 1933-cü ildə rayonun Beşdəli kəndində anadan olub. Rayonda Gənc Təbiətçilər dərnəyində işləyib. Pestə xala 7 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli «Analıq Şərəfi» Ordeni ilə təltif olunub. Onların 3 oğlu və 4 qızı vardı. İşğaldan sonra 24 aprel 2001-ci ildə Bakı şəhərində vəfat etmişdir.






-oğlu **Vaqif** 1949-cu ildə Zəngilan rayonunun Qıraq Müşlan kəndində anadan olub. 1966-cı ildə Pirçivan kənd orta məktəbini bitirdikidən sonra Naxçıvan şəhərində texnikum bitirmiş və rayondakı Lenin adına kolxozda mühasib işləyirdi. 27 noyabr 1969-cu ildə vəfat etmişdir. Subay idi. Allah rəhmət eləsin.

-qızı **Solmaz** 1952-ci ildə rayonun Qıraq Müşlan kəndində anadan olub. 1967-ci ildə orta məktəbin 8 sinfini, sonra Naxçıvan Pedaqoji Texnikumunu bitirib. Şəhər orta məktəbində müəllimə işləyirdi. İşğaldan sonra Nəsirov Vahid ilə ailə qurub.



-qızı **Xalidə** iyun 1955-ci ildə Pirçivan qəsəbəsində anadan olub. 1973-cü ildə şəhər orta məktəbi bitirib, yoldaşı Mirzə Beşdəli kəndindəndi və rayonda sürücü işləyirdi. İşgaldan sonra Bakı şəhəri Yasamal rayonu ərazisindəki yataqxanada məkunlaşmışlar. Cəfərova Xalidə Səfiyar qızı 31 dekabr 2005-ci ildə vəfat etmişdir. Onların Emin, Şahin və Ramil adlı üç oğlu var.

-oğlu **Adil** 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1974-cü ildə orta məktəbi, sonra isə Azərbaycan Politexnik İnstitutunu btirib. Yoldaşı Məleykə Keçikli kəndindəndir. Onların Orxan adlı oğlu və əkiz olan Kənan və Ləman adlı övladları var.

-oğlu **Nəriman** 1960-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1976-cı ildə şəhər orta məktəbini bitirib. Yoldaşı Xanım Mincivanlıdı. Onların Tural (uşaqları Zəhra, Mehti), Turanə (uşaqları Nurəli, Hüseyn) və Aysel (oğlu Rəşad) adlı üç övladı var.

-qızı **Nailə** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Həyat yoldaşı Tapdıqdı. Nicat, Nihad və Sevda adlı üç övladı var.

-qızı **Güllər** 1964-cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1981-ci ildə şəhər orta məktəbini bitirib. Yoldaşı Kazım Mincivanlıdı.

## Bədirxanov Seyfulla Cümü oğlu






Bədirxanov Seyfulla Cümü oğlu 1923-cü ildə rayonun Sobu kəndində anadan olub. 1941-1945-ci illərin Böyük Vətən Müharibəsinin iştirakçısıdır. Berlinə kimi döyüşlərdə iştirak edən Seyfulla 1945-ci ilin 24 aprelində Berlin yaxınlığında qolundan ağır yaralanıb. Müharibədən sonra 1945-ci ilin sentyabrında kəndə qayıdıb. Kənddə yaşamaq istəyi olsa da müəyyən səbəblərdən kəndi tərk edir. Şəhərimizdə əvvəl Sənaye Kombinatında, sonra Suvarma Sistemləri idarəsində, daha sonra isə R.İ.C.-də fəhlə işləyib. 11 aprel 1986-cı ildə vəfat etmiş və Sobu kəndində dəfn oluub.

## Bədirxanova Şüşə Kamal qızı






yoldaşı Bədirxanova Şüşə Kamal qızı 1927- ci ildə Sobu kəndində anadan olub. Əmisi qızıdır. Onunla bərabər əvvəl kombinatda, RIC-də xidmətçi, sonra Dezinfekisiya şöbəsində işləyib. 2012-ci ilin 16 sentyabrında Bakı şəhərində vəfat etmişdir. Şüşə Kamal qızı 1941-45-ci illərdə Rəşadətli əməyə görə, Qələbənin 50, 55 və 60 illiyi yubiley medalları ilə də təltif olunub. Onun onlarla tikmələri vardır. O eyni zamanda 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli «Analıq Medalı» ilə də təltif olunub. Onların Mənsimə (1947-1992), Filyar (1950-1959), Mənsurə, Yaqut adlı 4 qızı, Əli və Davud adlı iki oğlu olub

## Cümşüdova Mənsimə Seyfulla qızı



Cümşüdova Mənsimə Seyfulla qızı 21 senytabr 1947-ci ildə Sobu kəndində anadan olub. 1954-1961-ci illərdə qəsəbə orta məktəbində oxumuşdur, 14 yaşı olanda ərə verilmişdir. 07 fevral 1992-ci ildə faciəli surətdə həlak olmuşdur




Mənsimə 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.

**-qızı Filyar** 05 yanvar 1950-ci ildə Sobu kəndində anadan olub, 1959-cu ildə isə II sinifdə oxuyan vaxt Zəngilan qəsəbəsində difteriya xəstəliyindən vəfat etmişdir.

**-oğlu Cümsüdlü Əli (Əli Sobulu)** 20 sentyabr 1953-cü ildə Sobu kəndində anadan olub. 1971-ci ildə orta məktəbi bitirib.

-qızı **Mənsurə** 27 iyul 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1964-1974-cü illərdə şəhər orta məktəbində oxumuşdur, ADU-nun filologiya fakültəsini bitirib. İşğal ərəfəsində 1 saylı şəhər orta məktəbində işləyirdi. Ruslan və Azər adlı iki oğlu var. İşğaldan sonra İranın Məşhəd şəhərindəki İmam Rza (ə) ziyarətgahında olmuşdur.

-oğlu **Davud** 26 iyun 1961-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1968-1978-ci illərdə şəhər orta məktəbində oxumuş, sonra Naxçıvan şəhərində sürücülük kursunu bitirmişdir. İşğal ərəfəsində evli idi və rayon İstehlak Cəmiyyətində sürücü işləyirdi. İşğaldan sonra İranın Məşhəd şəhərindəki İmam Rza (ə) ziyarətgahında olmuşdur. Elvin və Yusif adlı iki oğlu var

-qızı **Yaqut** 29 dekabr 1971-ci ildə Zəngilan şəhərində anadan olub. 1978-1988-ci illərdə şəhər 1 saylı orta məktəbində oxumuşdur, Azərbaycan Dövlət Musiqi Akademiyasını bitirib.

İşğal ərəfəsində Sumqayıt şəhərində S.Hacıbəyov adına Musiqi məktəbində oxuyurdu. Subay idi. Işğaldan sonra ailə qurub. Yoldaşı Balaqadaşov Telman Malik oğlu əslən Quba rayonundandır. 2015-ci ilin oktyabrında vəfat etmişdir. Zaur və Ziya adlı iki oğlu var.

## Qurbanov Kərim İsmixan oğlu



Qurbanov Kərim İsmixan oğlu 20 iyul 1928-ci ildə Zəngilan rayonunun Samoğlu kəndində anadan olub. 1962-63-cü illərdə, Qubadlı rayonu ilə Zəngilan ikinci dəfə birləşib ayrılandan sonra Zəngilan qəsəbəsinə gəlmişdir.

Qurbanov Kərim İsmixan oğlu əvvəllər Sanitar Epidemioloji Stansiyada sürücü işləmişdir. Kərim Qurbanov 25 mart 2006-cı ildə Sumqayıt şəhərinə vəfat etmişdir.

## Qurbanova Mələk Nəbi qızı



Yoldaşı Qurbanova Mələk Nəbi qızı 16 iyun 1931-ci ildə anadan olub. Onlarln iki oğlu, iki qızı var. Mələk xala bildiyimə görə Qafan rayonundandı. İşğal zamanı Kərim dayı və Mələk xala sonbeşik İnqiab ilə birgə yaşayırdı.

Onlar Rayonun işğalından sonra Sumqayıt şəhərində məskunlaşmışlar.

-oğlu İsmixanov **Rəsid** 1954-cü ildə Pirçivan qəsəbəsində anadan olub. 1972-ci ildə şəhər orta məktəbini, sonra isə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirmişdir. İşğal ərəfəsində evli idi və 1 saylı şəhər otra məktəbində işləyirdi. Rəşid İsmixanov 2016- cı ildə vəfat etmişdir.

-qızı **Məstan** uşaq ikən suvarma kanalına düşərək dünyasını dəyişmişdir.

-qızı **Məstan (**O Məstanın adlısıdı**)** 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1974-cü ildə şəhər orta məktəbini bitirib. İşğal ərəfəsində evli idi və Sumqayıt şəhərində yaşayırdı.

-qızı **Sona** 1960-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1967-1977-ci illərdə şəhər orta məktəbində oxumuşdur. Rayon Mərkəzi Xəstəxanasında tibb bacısı işləyirdi.

-oğlu **Inqilab** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1969-1979-cu illərdə şəhər orta məktəbində oxumuşdur. İşğal ərəfəsində evli idi və ƏMXK–da işləyirdi.

## Kərimov Heydərqulu Qibləli oğlu



Heydərqulu Qibləli oğlu Kərimov 1913-cü ildə rayonun Yusiflər kəndində anadan olub. Gec də olsa o rayon ərazisinə olan 5 sinifli Kəndli-Gənclər məktəbinə daxil olur. Digərlərinə baxanda yaşının çox olmasına baxmır və yaxşı oxuyur. Sonra Füzuli (keçmiş Qaryagin) şəhərində müəllimlər hazırlayan pedaqoji məktəbə daxil olub. Məktəbi bitirdikdən sonra onu Dilicana (indiki Ermənistan R-nın rayonu) göndərirlər. Orada bir müddət işlədikdən sonra rayona dönən H.Kərimov Şayıflı kənd məktəbində müəllimlik etmiş, sonra isə direktor təyin edilmişdir. Sonra Zəngilan qəsəbəsinə köçmüş, rayon PK-də işləmişdir. 1938-ci ildə onu Bartaz kənd 7-illik məktəbinə müəllim göndərmişlər. Bir müddət sonra onu direktor təyin edirlər. 1942-ci ilə kimi burada işləyən H.Kərimov rayon mərkəzinə qayıdır və Rayon PK-də təlimatçılıq işini davam etdirir. 1948-1950-ci illərdə o, Bakı Ali Partiya məktəbində oxumuş, rayona qayıtmış və Rayon PK-də şöbə müdiri olmuşdur. H.Kərimov 1952-ci ildə Pirçivan qəsəbə orta məktəbinə direktor təyin olunmuş, eyni zamanda qiyabi olaraq Azərbaycan DPİ-nun tarix-coğrafiya fakültəsini bitirmişdir.

Sonrakı illərdə müxtəlif sahələrdə çalışan H. Kərimov 1961-ci ildə yenidən Zəngilan qəsəbə orta məktəbinə direktor təyin edilmişdir. Son illərdə o məktəbdə müəllimlik etmiş, Tarix-diyarşünaslıq müzeyinin və axşam məktəbinin direktoru işləmişdir. H.Kərimov 1995-ci ilin 09 oktyabrında Bakı şəhərində vəfat etmişdir[1].

## Kərimova Zeynəb Əsad qızı






**Zeynəb** xanım 1927-ci ildə Bartaz kəndində anadan olub. O Eşitdiyimə görə müəllimə idi, amma işləmirdi. Onların 3 qızı, iki oğlu var.

İşğal zamanı Cəmilə xanım Bakı şəhərində, Sonya xanım Mincivanda, Almas xanım isə bilidiyimə görə Rusiyada yaşayırdı. Ağa Kərimov Bakıda polis sistemində, Ərəstun isə rayonda hərbi müəllim vəzifəsində idi. Zeynəb xala 1988-ci ildə rayonda vəfat etmişdir. O 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.

**-qızları Cəmilə** 1947-cii ildə Pirçivan kəndində anadan olub. 1954-1964-cü illərdə qəsəbə orta məktəbində oxumuşdur. İşğal ərəfəsində evli idi və Bakı şəhərində yaşayırdı.

**-qızları Sonya** 1950-ci ildə Pirçivan kəndində anadan olub 1967-ci ildə Zəngilan şəhər orta məktəbini bitirib. İşğal ərəfəsində evli idi və Mincivan qəsəbəsində yaşayırdı.

**-qızları Almas** 1961-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1978-ci ildə şəhər orta məktəbini bitirib. İşğal ərəfəsində evli idi və Rusiyada yaşayırdı.

[1] s.132-134. Tarverdi Abbasov. Zəngilanın Bartaz kəndi və onun 100 yaşlı məktəbi. Bakı, Əkizlər nəşriyyatı 2012. 376 s.



**Kərimov Ağa Heydərqulu oğlu** 23 sentyabr 1953-cu ildə Pirçivan kəndində anadan olub. 1960-1970-ci illərdə şəhər orta məktəbində oxumuşdur. Orta məktəbi bitirdikdən sonra bir müddət rayon xalq məhkəməsində katib işləyib. Sonra hərbi xidmətdə olmuşdur. Hərbi xidmətdən sonra Ağa Kərimov Bakı milis məktəbini bitirib. İşğal ərəfəsində Bakıda yaşayırdı və eyni zamanda Polis sistemində işləyirdi. Polis podpolkovniki olan A.Kərimov 10 may 2004-cü ildə Bakı şəhərində vəfat etmişdir.



**Kərimov Ərəstun Heydərqulu oğlu** 01 mart 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1966-1976-cı illərdə şəhər orta məktəbində oxumuşdur. Orta məktəbi bitirdikdən sonra Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Bədən tərbiyəsi və hərbi hazırlıq fakültəsinə daxil olub. Ali məktəbi bitirdikdən sonra hərbi xidmətə getmişdir. Hərbi xidmətdən sonra rayona qayıdan Ə.Kərimov orta məktəblərdə hərbi hazırlıq müəllim işləmişdir. Ə. Kərimovun bir qızı və bir oğlu var. O, 2017–ci ilin 28 martında dünyasın dəyişmişdir.



**Kərimov Seymur Ərəstun oğlu** 07 sentyabr 1991-ci ildə Zəngilan şəhərində anadan olub. 2008-ci ildə orta məktəbi bitirib. 2009-cu ildə 600 balla Azərbaycan Polis Akademiyasına daxil olub. 2014-cü ildə oranı bitirmişdir, təyinatla Dəvəçi (İndiki Şabran) rayonuna əməliyyatçı göndərilir. 2015-ci ilin 29 mayında avtomobil qəzası nəticəsində həlak olub.

## Həsənov Bəylər Təhməz oğlu



Həsənov Bəylər Təhməz oğlu 03 noyabr 1923-cü ildə Sarallı Xəştab kəndində anadan olub. Azərbaycan XT İnstitutunu bitirən B.Həsənov 50 ildən də çox rayon Maliyyə şöbəsində büdcə inspektoru işləyib. Bu arada o bir müddət RİC-nin də sədri işləmişdir. Həsənov Bəylər 17 iyul 2015- ci ildə 91 yaşında Bakı şəhərində vəfat etmişdir.

## Qocayeva Zəhra Abbas qızı






Yoldaşı Qocayeva Zəhra Abbas qızı 1928–ci ildə rayonun Sarallı Xəştab kəndində anadan olub Ağdam Tibb məktəbini bitirən Zəhra Qocayeva isə ömrünü rayon Mərkəzi Xəstəxanası ilə bağlamış və orada uzun müddət tibb personeli kimi işləmişdir. Onların iki qızı, üç oğlu var. Zəhra xala 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub. O 2020-ci ildə Bakı şəhərində vəfat etmişdir.

**-qızı Təhməzova Maya** 24 aprel 1953-cü ildə Pirçivan kəndində anadan olub. Orta məktəbin 7 sinfini bitirdikdən sonra Bakı şəhərinə getmiş və orada o vaxtkı Razin (indiki Bakıxanov) qəsəbəsindəki orta məktəbdə oxumuşdur. Hal-hazırda həmin məktəb Maya xanımın xalası oğlu şəhid Nazim Ağakişioğlu İsmayılovun adını daşıyır. Orta məktəbi bitirdikdən sonra ADU-nun Kitabxanaçılıq fakültəsinə daxil olub. Sonraki illərdə o inzibati

orqanlar suistemini seçmiş və Binəqədi rayon polis şöbəsində əvvəl uşaqlara iş üzrə inspektor, sonra isə pasport masa rəisi olub. O eyni zamanda Bakı polis akademiyasını da bitirib. Hazırda Polis polkovnik-leytinant rürbəsində istefadadır. Yoldaşı Əzizov Muxtar Haqverdi oğlu da Zəngilanlıdır və həkimdir. Onların Emil (Tibb U-ni bitirib) və Elvin (BDU-nun hüquq fakültəsini bitirib) adlı iki övladı var.

**-qızı Təhməzova Minayə** 07 noyabr 1955-ci ildə Pirçivan kəndində anadan olub. 1971-ci ildə şəhər orta məktəbini, sonra Azərbaycan Pİ-nin Təhsil Pedaqoqikası və Metodikası fakültəsini bitirib. Ali məktəbi bitirdikdən sonra əvvəl 2 saylı, sonra isə 3 saylı orta məktəbdə işləyib.

Həyat yoldaşı Həsənov Xürrəm Şahsuvar oğlu 26 sentyabr 1948-ci ildə anadan olub. Onların Əlqəmə adında bir oğlu, Aidə və Fəridə adında iki qızları var.

-**oğlu Həsənov Bəhram** 1957-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1963-1974-cü illərdə şəhər orta məktəbində oxumuşdur. İşğal ərəfəsində evli idi və Rusiyada yaşayırdı. Həyat yoldaşı Tamara xanımdır. Onların Oksana və Elvina adıda iki övladı var.

**-oğlu Bəhmən** 1958-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1965-1975-ci illərdə şəhər orta məktəbində oxumuşdur. İşğal ərəfəsində Rusiyada yaşayırdı. Həyat yoldaşı Ramilə Dadaş qızıdır. Onların Emin, Bəylər və Eqlisa adlı üç övladı var.

**-oğlu Qorxmaz** 1963-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1980-ci ildə şəhər orta məktəbi, sonra isə Azərbaycan DBT İnstitutunu bitirib. İşğal ərəfəsində orta məktəblərindən birində dərs deyirdi. Həyat yoldaşı Cəfərquliyeva Elnarə Tofiq qızıdır. Onların Bəylər və Zaur adlı iki övladı var.

## Qocayev Əli Eyvaz oğlu



Qocayev Əli Eyvaz oğlu 1926-cü ildə rayonun Saralı Xəştab kəndində anadan olub. Şəhərimizə təxminən 1962-63-cü illərdə, Qubadlı rayonu ilə Zəngilan ikinci dəfə birləşib ayrılandan sonra gəlmişdir. Azərbaycan Politexnik Texnikumunu bitirən Əli dayı uzun müddət Suvarma Sistemləri idarəsində mənim atamla bərabər işləyib. Sonralar isə tikinti idarəsində tikinti mühəndisi kimi çalışıb. Işini sevən, bacarıqlı biri olub. Onlar beş qardaş, iki bacı olublar. Ailənin böyük oğlu Mürsəl Qocayevi rayonumuzda eləcədə Respublikda tanımayan yoxdu. Qardaşlardan Müsrsəl, Səməd və Vaqif müəllim, Vəli isə sürücü idi. Bacıları Telli xanım və Siratel isə bir el ağbirçəyi idilər.

Əli dayı öz hazırcavablığı ilə seçilirdi. Işğal ərəfəsində 13 saylı tikinti təmir idarəsində işləyirdi. Əli dayı rayonun kəndlərində çox sayda mağaza tikmişdir. Işğaldan sonra 2010 -cu ildə Bakı şəhərində vəfat etmişdir.

## Kərimova Bənövşə Cəmil qızı



Yoldaşı Kərimova Bənövşə Cəmil qızı 1930-cu ildə Sarallı Xəştab kəndində anadan olub. Onun atası, əmiləri dövrünün təhsilli adamları olublar. Sovet hakimiyyəti gələndə atasına dindən əl çəkib məktəbdə dərs deməklə kifayətlənmək təklif olunsa da o bunu qəbul etməyib. Nəticədə o həbs olunmuş və sürgündə vəfat etmşdir. Əmisi Molla Kərim Əfəndi İraqda Nəcəf şəhərində dini təhsil alıb. Bənövşə müəllimə gil 5 qardaş iki bacı olublar. İsmayıl adlı

qardaş müharibədən qayıtmayıb. Didər qardaşları Kərim və Yusif isə rayonumuzun tanınan adamları olublar. Bacısı Güllər xanım isə Bakıda müəllimə işləyirdi. O Bakıda mənə dərs deyib. Ali təhsilli biologiya müəllimi olan Bənövşə xanım şəhər1 saylı orta məktəbdə dərs deyirdi. O 2002-ci ilin martında Bakı şəhərində vəfat etmişdir. Onlar 1953-cü ildə ailə qurmuşlar. Bir qızları, üç oğlanları var.

**-qızları Zöhrə** 17 may 1954-cü ildə S. Xəştab kəndində anadan olub. 1960-1970-ci illərdə şəhər orta məktəbində oxuyub. Sonra 1976-cı ildə Azərbaycan Dövlət Pedaqoji İnstitutunu bitirmişdir. İşğal ərəfəsində evli idi Sumqayıt şəhərində yaşayırdı. Yoldaşı Muradov Fazil əslən Qubadlı rayonundandır. Onların Zəfər adlı oğlu (mühəndisdir) Gülarə (həkimdir) adlı qızları və eyni zamanda Səid, Nəriman, Murad, Aytac adlı nəvələri də var.

**-oğlu Azad** 12 dekabr 1956-cı ildə S.Xəştab kəndində anadan olub. 1972-ci ildə şəhər orta məktəbi, sonra 1977-ci ildə Azərbaycan Politexnik İnstitutunu bitirmiş, təyinatla Başqırdıstan Respublikasına göndərilib. Hazırda Ufa şəhərində yaşayır. Yoldaşı tatar qızı Gülmirdir. Cəmil, Səidə adlı iki övladı və Timur adlı nəvəsi var.

**-oğlu Azər** 27 mart 1958-ci ildə S.Xəştab kəndində anadan olub.1974-cü ildə şəhər orta məktəbini, sonra Dnepropetrovsk Metallurgiya İnstitutunu bitirib. İşğal zamanı rayon Konserv zavodunun direktoru idi. Həyat yoldaşı Cəfərova Aidə Alı qızı həkimdir. Onların Gülnar və Aybəniz adlı iki qızı və Səbinə adlı bir nəvəsi var..

**-oğlu Ayaz** 18 fevral 1967-ci ildə Zəngilan şəhərində anadan olub. 1984-cü ildə şəhər orta məktəbiniu bitirib. İşğal ərəfəsində konserv zavodunda işləyirdi. Həyat yoldaşı Məmmədova Güllər Xankişi qızı Zəngilanlıdır. Onların Rövşən adlı bir oğlu, Zeynəb adlı bir qızı və eyni zamanda Əli, Fatimə adlı isə iki nəvəsi var. Ayaz Qocayev hal-hazırda Bakı metropolitenində işləyir.

## İki dost

*(Əli dayının qızı Zörhə xanımın yazısı)*

Iki dost var idi. Biri Xürrəm, biri Fazil. Onlar eyni ildə anadan oldular və eyni ildə də dünyalarını dəyşdilər.

Biri Zəngilanda, biri də Qubadlıda olurdu. Tale onları Bakıda görüşdürdü. Onlar bir- birinə sadiq dost oldular. Hər ikisi xaraktercə mehriban, qabilyyyətli, saf, təmiz ürəkli idilər. Eyni ildə birinci sinfə getmiş, eyni ildə orta məktəbi bitirmiş, eyni ildə də ali məktəbə qəbul olmuşdular. Beş il tələbəlik həyatı yaşadılar, bir- birinin evinə gedib gəldilər, ailəvi dost oldular.

Dərdləri, sirləri bir oldu. Diplom qabağı praktikada (Moskva şəhərində) bir- birinə dayaq, kömək oldular. Fazil ağsaqqal, Xürrəm zarafatcıl, şiltaq idi. Onları birləşdirən tamamlayan mənəvi saflıqları, qabiliyyətləri, dostluğa sədaqətləri idi. Bu dostluq sonradan qohumluğa çevrildi. Xürrəm iki qohum, qonşunun bir qızı ilə, Fazil isə o biri qızı ilə evləndi. Gözəl yaxşı övladları oldu. Böyüdülər, baba sevinci yaşadılar. Oğul, qız toyu gördülər. Cəmiyyətdə, işdə layiqli yer tutdular.

Xürrəmin Fazilin toyundakı çıxışından bir örnək:

-Ay camaat bu Fazil məndən nə istəyir, bilmirəm. Mən 1948-ci ildə doğuldum, buda doğuldu. 1956-cı ildə 1 sinifə getdim, bu da getdi. 1966-cı ildə orta məktəbi bitirdim, bu da bitirdi, Azərbaycan Politexnik İnsitutuna sənəd verib qəbul oludum, bu da oldu. Nəhayət İnstitutu bitirib mühəndis olundum, bu da mənim kimi. Bu Fazil mənə çox sataşır. Mən bir evin bir qızın aldım, bu da o biri qızın. Deyin görüm bu Fazil məndən nə istəyir.

Onların dostluqlarını mən Ü.Hacıbəyovla M. Maqomayevin dostluğuna bənzədərdim. 2017-ci ildə hər ikisi dünyasın dəyişdi. İl mərasimləri də eyni ilə təsadüf etdi. Hər ikisi 69 yaşında həyatdan köçdü. Bu il hər ikisinin 70 yaşı tamam oldu. Allah rəhmət eləsin.

## Əli dayının lətifələrindən bir neçəsi

1.Bir gün Bakıda gəzərkən dilənçi qarşısını kəsərək:

-Əli yolunda-deyərək əlini açır. Əli dayı ona deyir:

-Ay sağ olmuş Əlinin yolu var. Əlinin yolunu qonşuları kəsib.

2. Əli dayı Qubadlıya zəng eləmək istəyir. O vaxt indiki telefonlar yox idi. O Poçtun işçisinə deyir:

-Bacı sabahın xeyir olsun. Allah köməyin olsun. Məni Qubadlı ilə danışdır.

Aradan bir neçə saat keçir. Xəbər çıxmır. Nəhayət axşama yaxın bacı deyir ki, telefon işləmir. Belə olanda Əli dayı deyir:

-Mən sənə dedim sabahın xeyir. Allah köməyin olsun. İndi ki, belədir heç sabahın xeyir olmasın, Allah da köməyiniz olmasın.

3. Bir gün Əli dayının dayısı onlara deyir ki, gedək meşədən mənə mil kəsək. Evin üstü açıqdı onu örtmək lazımdı. Çox çətinliklə ardıc ağacını kəsib gətirirlər. Əli dayı dayısına deyir:

-Dayı bu ardıc sənin fikrin deyil. De görüm bunu kim sənin başına salıb. Dayısı filankəs deyəndə, Əli dayı deyir ki, siz çörəyinizi yeyin mən gəlirəm. Tez gedib həmin adamı tapıb deyir:
-Ə utanmırsan. Ardıcdanda mil olar.

4. Əli dayının qızı Zöhrə xanım deyir:

-Biz uşaq vaxtı mehriban olsaq da, tez-tez dalaşardıq. Bir gün atam hərəmizin əlinə bir ağac verib çölə saldı və dedi: -Gedin köpək uşağı bir-birinizi qırın. Elə bil ki, hərəsi bir arvaddandı.

5. Oğlanlarından birinin toyunda Əli dayı ilə Bənövşə müəllimə aşpaz məsələsində razılığa gələ bilmirlər. Bənövşə müəllimə qadın aşpaz istəyirdi. Əli dayı isə öz namizədini irəli sürəndə Bənövşə müəllimə deyir ki, o keçəldi. Belə olanda Əli dayı deyir:

-Aaz o yaxşıda da, başında tük də yoxdu ki xörəyə düşsün.



**Bir ailə fotosu. Soldan sağa:**
**Bənövşə müəllimə, oğlu Azad, Ayaz və qızı Zöhrə**

## Axundov Həsən Məhəmməd oğlu



Axundov Həsən Məhəmməd oğlu rayonun Arazboyu Muğanlı kəndində anadan olub. Şəhərimizə nə zaman gəldiyi barədə məlumat ala bilmədim. Həsən dayı uzun illər rayonun müxtəlif idarə və müəssisələrində rəhbər vəzifələrdə çalışıb. Rayon mərkəzinə köçməmişdən əvvəl Hacallı kənd ZDS İK-nin sədri vəzifəsində işləyib. Bildiyimə görə onun son iş yeri Rayon İcraiyyə Komitəsi olub. İşğaldan əvvəl rayonda vəfat edib.

-yoldaşı **Talıbova Məhrux Qəhrəman** qızı rayonun Malatkeşin kəndindəndir. Mahrux xala məhəlləmizdə yeganə Qəhrəman anadır. İşğaldan sonra Bakı şəhərində vəfat edib. Onların 5 qızı, 5 oğlu var.

**-qızları** Minarə, Dilarə, Səmayə, Xanım, Şövkət, oğlanları Məhəmməd, Cümşüd, Yavər, Sabir və Bəbir.

-oğlu Cümşüd rayon Mərkəzi Xəstəxanasında sürücü işləyirdi. Məhəllədə yaşayırdı.

-oğlu Yavər həkim cərrahdı. İşğal zamanı rayon Mərkəzi Xəstəxanasında cərrah işləyirdi.

-oğlu Sabir 1947-ci ildə Arazboyu Muğanlı kəndində anadan olub, evli idi. Ali təhsilli mühəndisdi. İşğal zamanı Sumqayıt şəhərində yaşayırdı.

**Məmmədov Bəbir Həsən oğlu** 1955- ci ildə anadan olub. 1962-1972-ci illərdə şəhər orta məktəbində oxuyub. Orta məktəbi bitirdikdən sonra sürücülük kursunu bitirib. Evli idi. Rayonda sürücü işləyirdi və ata evində yaşayırdı.

Yoldaşı Xanım müəllimə Muğanlı kəndindən idi. Rayonda orta məktəbdə dərs deyirdi. İşğaldan sonra Bakı şəhərində vəfat etmişdir. Onların iki oğlu var.

## Vəliyev Əliş Səfər oğlu



Vəliyev Əliş Səfər oğlu 1928-ci ildə rayonun İçəri Müşlan kəndində anadan olub. Orta məktəbi bitirdikdən sonra Azərbaycan Neft Kimya İnstitutuna (o illərdə Azərbaycan Sənaye İnstitutu adlanırdı) daxil olub. Lakin atasının dünyasını dəyişməsi səbəbindən təhsilini bitirə bilməyib. Sonra rayon mərkəzinə köçən Əliş Vəliyev rayonun işğalına kimi Zəngilan rayon mərkəzi (son illərdə Aqrar Sənaye Bankı) Bankında əməliyyatçı-kassir vəzifəsində işləyib.

Vəliyev Əliş Səfər oğlu rayonun işğalından sonra 22 aprel 2002 -ci ildə Bakı şəhərində dünyasını dəyişib.

Həyat yoldaşı Məleykə xanım tibb bacısı isi. Onların iki oğlu, 5 qızları var.

## Əliyeva Məleykə Kərim qızı



Yoldaşı Əliyeva Məleykə Kərim qızı 1938-ci ildə Ermənistan SSR-nin Qafan rayonunun Hunut kəndində anadan olub. Orta təhsilini bitirdikdən sonra Məleykə xanım Bakı şəhərindəki Tibb Texnikumuna daxil olmuş və oranı bitirmişdir. Sonra təyinatla Zəngilan rayon mərkəzi xəstəxanasına göndərilmişdir.

Əliyeva Məleykə Kərim qızı burada rayonun işğalına kimi əhalinin sağlamlığı keşiyində dayanmışdır. Bu dövrdə o Əliş Vəliyevlə tanış olmuş və onunla ailə qurmuşdur.

Əliyeva Məleykə Kərim qızı rayonun işğalından sonra 2015-ci ilin iyun ayında Bakı şəhərinə dünyasın dəyişib.

-qızı **Lətifə** (Əliş dayının ilk yoldaşından) 1950-ci ildə Pirçivan kəndində anadan olub. Bakı Plan Uçot texnikumunu bitirib. Üç oğlu var. Hal-hazırda Bakı şəhərində yaşayır. oğlu Adil Texniki Universiteti bitirib, mühəndis işləyir, digər oğlu Əhməd teleqülldə texnik, Məzahir isə işsizdir

-oğlu **İlham** 1958-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Azərbaycan İnşaat Mühəndisləri İnstitutunu bitirib. İki oğlu var. Hal-hazırda Bakı şəhərində yaşayır. Kənan İlham oğlu İqtisad Universitetini bitirib mühəndis işləyir, Kamran İqtisad Universitetini biritirib, sonra Almaniyada, magistraturada oxuyub, prezident aparatı yanında İdarəetmə Universitertində ikinci təhsil alır, eyni zamanda hava limanında işləyir.

-qızı **Sahibə** 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub. Məktəbəqədər Pedaqoji texnikumu bitirib. İki oğlu var. Hal-hazırda Bakı şəhərində yaşayır. Sahibə xanımın oğlu Orxan Bakı Dövlət Universitetini bitirib arxeoloq işləyir, digər oğlu Tural İqtisad Universitetini bitirib Azersuda işləyir, üçüncü oğlu

Qarabəy Politexnik Universitetini bitirib

-qızı **Fəranə** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Orta təhsilli olan Fərqanə xanın Bakı şəhər XDS-nin deputatı olub. Bir oğlu, bir qızı var. Bakıda yaşayır. Fərqanə xanımın oğlu Nicat prezident aparatı yanında idarəçilik Akademiyasını bitirib, Londonda magist oxuyub, hazırda ipoteka fondunda işləyir, qızı Günel Pedaqoji Universiteti bitirib müəllimə işləyir.

**-** oğlu **Vəliyev Azər**



Vəliyev Azər Əliş oğlu 06 dekabr 1963-cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1970 -1980 -ci illərdə Zəngilan şəhər orta məktəbinə oxuyub. Orta məktəbi bitirdikdən sonra Ağdam şəhərindəki müsiqi məktəbinə daxil olub, tar sinfi üzrə məktəbi bitirib.

Musiqi məktəbini bitirdikdən sonra Zəngilana gələn Azər Əliş oğlu şəhər musiqi məktəbində tar müəllimi kimi əmək fəaliyyətinə başlayıb.

Vəliyev Azər Əliş oğlu 1993- cü ildə Ermənistan Silahlı qüvvələrinin rayonu işğalından sonra Bakı şəhərində müvəqqəti məskunlaşıb.

Bakı şəhərində də öz peşəsini davam etdirməklə yanaşı operatop və fotoqraf kimi də fəaliyyət göstərib. Ailəli idi, bir oğlu, bir qızı var. Rayonun işğalından sonra Azər Vəliyev Azərbaycan Kənd Təsərrüfatı Akademiyasını bitirmişdir.

Vəliyev Azər Əliş oğlu 2020- ci ildə pis xəstəliyə tutulmuş, və uzun sürən xəstəlikdən sonra 31 may 2021-ci ildə dünyasını dəyişib. Allah rəhmət eləsin.

Azər yaxşı gitara çalardı. Zəngilanlı mahir qarmon ifaçısı Asif Bağırov deyir ki, mən onu özümlə toylara aparardım. Zeynəb Azər qızı İqtisad Universitetini bitirib, baş mühasib işləyir, oğlu Vüsal İqtisadi Universitetini bitirib hazırda İqtisadi İnkişaf Nazirliyində meteoroloq işləyir

-qızı **Gülnarə** 1967-ci ildə Zəngilan şəhərində anadan olub. Plan İqtisad Texnikumunu bitirib. İki qızı var. Hal-hazırda Bakı şəhərində yaşayır. Gülnarə xanımın qızı Qumru Pedaqoji Universiteti bitirib, ibtidai sinif müəllimısi işləyir, digər qızı Humay İqtisad Universitetini bitirib Asan Xidmətdə çalışır

-qızı **Sevinc** 1972-ci ildə Zəngilan şəhərində anadan olub. Mədəniyyət və İncəsənət kollecini bitirib. İki qızı var. Hal-hazırda Bakı şəhərində yaşayır. Sevinc xanımın qızı Nəcibə Bakı Dövlət Univetsitetinin III kurs, tələbəsi, digər qızı İnci isə orta məktəbin 5-ci sinifində oxuyur

## Həsənov Allahverən Gülmalı oğlu

*Sosialist Əməyi Qəhrəmanı*





Həsənov Allahverən Gülmalı oğlu 1915-ci ildə rayonun Sarıl kəndində anadan olub. A.Həsənov 1941-1945-ci illər Böyük Vətən Müharibəsinin iştirakçısıdır. Uzun illər rayonda rəhbər vəzifələrdə çalışıb. İşğaldan əvvəl rayonda vəfat etmişdir. İki oğlu, iki qızı var idi. Yoldaşı Vəzifə xanımdı.

-oğlu Səlim ali təhsilli aqronom idi və şəhərimizin başqa hissəsində yaşayırdı. İşğaldan əvvəl rayonda vəfat etmişdir.

-qızı Sənəm şəhərimizin başqa hissəsində yaşayırdı. Uzun illər şəhərimizdə satıcı işləmişdir.

-qızı Mənzər tibb bacısı idi və Şayıflı kəndində yaşayırdı.

## Həsənov Sabir Allahverən oğlu



Həsənov Sabir Allahverən oğlu 1947-ci ildə Pirçivan kəndində anadan olub. 1954-1964-cü illərdə qəsəbə orta məktəbində oxuyub. İşğal ərəfəsində məhəllədə ata evində yaşayırdı. Həsənov Sabir şəhərimizdə tikinti təşkilatlarında işləyirdi. İşğaldan sonra 2012-ci ilin aprel ayında vəfat etmişdir.

Həyat yoldaşı Həsənova Asya Eylas qızı 07 noyabr 1951-ci ildə anadan olub.

-oğlu Akif 23 mart 1975-ci ildə Zəngilan şəhərində anadan olub. Ailəlidir 2 övladı var.

-oğlu Radif 01 sentyabr 1977-ci ildə Zəngilan şəhərində anadan olub. Ailəlidir 2 övladı var.

## Heydərov Məhəmməd Heydər oğlu



Heydərov Məhəmməd Heydər oğlu 1908-ci ildə indiki Zəngilan rayonunun Malatkeşin kəndində anadan olub. Erkən yaşlarında atasını itirmiş, anasının himayəsində qalmışdır. 1927-ci ildə kənd məktəbini bitirdikdən sonra kənddə təsərrüfatla məşğul olmuşdur. Bu dövr Azərbaycanın ucqar rayonlarında qolçomaqlarla mübarizə dövrü kimi yadda qalmışdır.

1930-cu ildə ətraf kəndlərdən və qonşu rayonlardan olan Sovet hökümətinin siyasətindən və kolxoz quruluşundan narazı olan varlılar qaçaqçılıq yoluna düşərək Sobu kəndinin ətrafındakı meşələrdə gizlənmişdilər. Onların özbaşınalığından yerli camaat da əziyyət çəkirdi. Qaçaqlarla mübarizədə M. Heydərov da yerli milis dəstələrinə kömək etmişdir. Sonra onu orduya çağırdılar. 1930-1932-ci illərdə Bakıdakı Azərbaycan diviziyasının

tərkibində xidmət elədi. 1932-ci ildə partiya məktəbinə daxil olmuş, məktəbi bitirəndən sonra Ağdama Komsomol işinə göndərilmişdir.

1934-cü ildə Zəngilana qayıdan M.Heydərov rayon Komsomol Komitəsinə I Katib seçilir. 1935-ci ilin sonunda onu Azərbaycan KP MK-nın nəzdindəki məktəbə göndərirlər. Məktəbi bitirdikdən sonra yenidən rayona dönən Heydərov Torpaq Şöbəsinə müdir təyin olunur. 1938-42 ci illərdə rayonda çıxan **«Stalinçi»** qəzetinin redaktoru olmuş, 1942-ci ildə müharibənin başlaması ilə əlaqədar orduya səfərbər olunan Heydərov bu işdən azad olunmuşdur. Onun Qafqazdan başlanan döyüş yolu Berlində sona çatib.

Ordudan təxris olduqdan sonra rayona gələn M. Heydərov rayon Partiya komitəsinin III katibi, rayon XDS İcraiyyə Komitəsinin sədri kimi mühüm vəzifələrdə çalışmışdır. 1954-cü ildə onu Bakı Ali partiya məktəbinə göndərirlər. 1958-ci ildə Ali Partiya məktəbini bitirəndən sonra rayon Kənd Təsərrüfatı Müfəttişliyinə Rəis təyin olunmuşdur. Məhəmməd Heydərov 1990-cı ildə dünyasını dəyişmişdir.

## Həsənova (Heydərova) Fatma Məmi qızı






Yoldaşı Həsənova Fatma Məmi qızı 1928-ci ildə Malatkeşin kəndində anadan olub. Oğlu Tofiqin dediyinə görə 1954-cü ildə buraya gəlmişlər. H.Məhəmməd 1977- ci ildə hazırki evi oğlu Tofiqə verərək ailəsi ilə bərabər Malatkeşin kəndinə köçmüşdür. Onların 5 oğlu və bir qızları var. Fatma xala 2020-ci ildə Bakı şəhərində vəfat etmişdir.

Həsənova Fatma Məmi qızı 6 uşaq tərbiyə etdiyinə görə I

dərəcəli «**Analıq Medalı**» ilə təltif olunub.

-qızı **Zənfirə (**Qəmər Musayevadan olan qızıdı) 30 may 1941-ci ildə Malatkeşində kəndində anadan olub. 2008-ci ildə vəfat edib.

-oğlu **Yusif** 1948-ci ilin iyun ayının 30-da Malatkeşin kəndində anadan olub. Zəngilan qəsəbə orta məktəbini sonra isə kənd təsərrüfatı Texnikumunu bitirib. Malatkeşin kəndinə yaşayırdı. Rayonda baytar aptekinin müdiri işləyirdi.

-oğlu **Bəxtiyar** 29 avqust 1953-cü ildə Malatkeşin kəndində anadan olub. 1970-ci ildə şəhər orta məktəbini, sonra isə Kirovabad şəhərində Kənd Təsərrüfatı İnstitutunu bitirmişdir. İşğal ərəfəsində rayonda məsul vəzifədə işləyirdi.

-oğlu **Rafiq** 13 aprel 1956-cı ildə Pirçivan kəndində anadan olub. 1972--ci ildə Zəngilan şəhər orta məktəbini, sonra isə sürücülük kursunu bitirmişdir. Rayonda sürücü işləyirdi.

-oğlu **İlqar** 12 aprel 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1976-ci ildə Zəngilan şəhər orta məktəbini, sonra tikinti texnikumunu bitirmişdir. Tikinti idarəsində işləyirdi.

-qızı **Firəngiz** 13 may 1961-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1968-1978-ci illərdə şəhər orta məktəbində oxuyub. İşğal ərəfəsində rayonda müəllimə işləyirdi.

## Heydərov Tofiq Məhəmməd oğlu



Heydərov Tofiq Məhəmməd oğlu 29 noyabr 1950–ci ildə Zəngilan rayonunun Malatkeşin kəndində anadan olub. 1957-1967-ci illərdə Zəngilan qəsəbə orta məktəbində oxuyub. Orta məktəbi bitirdikdən sonra ali məktəbə sənədlərini versə də müsabiqədən keçməyib.

1967-ci ilin sentyabr ayında şəhər 8 illik məktəbdə laborant, sonra isə kitabxanaçı

işləmişdir. 1968-ci ildə o vaxtkı V.İ.Lenin adına Azərbaycan Dövlət Pedaqoji İnstitutunun tarix fakültəsinin qiyabi şöbəsinə daxil olan Tofiq Heydərov 1971-ci ildə Sovet Ordusu sıralarına həqiqi hərbi xidmətə çağırılıb. O 1971-1973-cü illərdə Rusiyanın Xabarovsk vilayətində iki il hərbi xidmət keçmişdir.

Hərbi xidmətdən sonra rayonun Malatkeşin kənd orta məktəbinə müəllim təyin edilmişdir. Burada əvvəl müəllim, 1976-1980-ci illərdə direktor müavini, 1980-1992-ci illərdə isə direktor işləmişdir. 1992-ci ildə ona böyük etimad göstərilir və o rayon Təhsil şöbəsinə müdiri təyin edilir. O 1996- cı ilə kimi bu vəzifədə işlədi. Sonra Tofiq müəllim 2002-ci ildən Bakı şəhərindəki 8 saylı Zəngilan orta məktəbində direktor işləyib. Ailəlidir, iki oğlu var Həyat yoldaşı Fərəcova Aidə Əkbər qızıdı. Tofiq Məhəmməd oğlu Heydərov hal-hazırda təqaüddədir.

## Fərəcova Aidə Əkbər qızı



Yoldaşı Fərəcova Aidə Əkbər qızı 1954-cü ilin mart ayının 3-də Pirçivan kəndində anadan olub. 1971-ci ildə şəhər orta məktəbini bitirib. 1972-1978-ci illərdə isə N.Nərimanov adına Azərbayvan Dövlət Tibb İnstitutunda oxumuş oranı pediatr ixtisası üzrə bitirimişdir. İşğal ərəfəsində Rayon Mərkəzi Xəstəxanasında uşaq həkimi işləyirdi.

-oğlu **Elşad** 15 avqust 1980-ci ildə Zəngilan şəhərində anadan olub. İşğal zamanı orta məktəbdə oxuyurdu. Hal hazırda MTN sistemində işləyir, kapitandı.

-oğlu **Polad** 20 yanvar 1983-cü ildə Zəngilan şəhərində anadan olub. İşğal zamanı orta məktəbdə oxuyurdu. Hal hazırda Idman Akademiyasında müəllim işləyir.

## Quliyev İsmayıl Mehti oğlu



Quliyev İsmayıl Mehti oğlu 09 may 1921-ci ildə İskəndərbəyli kəndində anadan olub. Gəncə şəhərində Kənd Təsərrüfati Texnikumunu bitirən İsmayıl Quliyev eyni zamanda 1941-1945-ci illər müharibəsində iştirak etmişdir. Müharibədən sonraklı illərdə o MTS-də Baş mühəndis və s. vəzifələrdə işləyir.

İsmayıl Quliyev 28 may 2011-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## Əvəzova Mirvari Yəhya qızı



Yoldaşı Əvəzova Mirvari Yəhya qızı 08 mart 1932-ci ildə rayonun Ağalı kəndində anadan olub. O 01 fevral 2016-cı ildə Bakı şəhərində dünyasını dəyişib. O, I dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub. Onların üç oğlu iki qızı var idi.




-oğlu **Mahir** 1956-cı ildə Pirçivan kəndində anadan olub. 1973-cü ildə şəhər orta məktəbini, sonra isə Bakı Dəmiryolu Texnikumunu bitirib. Yoldaşı Mehtiyeva Sevdadır. Onların Yeganə, İsmayıl və Ülkər adlı üç övladları var.

-qızı **Nəzakət** 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub.1974-cü ildə şəhər orta məktəbini bitirib. Yoldaşı Orucov Kamran Məhəmməd oğludur. Onların Zaur, Gülnar və Əntiqə adlı üç övladı var.

-oğlu **Tahir** 1961-ci ildə Zəngilan qəsəbəsində anadan olub.

1978-ci ildə şəhər orta məktəbini, sonra isə Bakı Politexnik Texnikumunu bitirib. Yoldaşı İmişlidəndi. Onların Ülvi və Ülviyyə adında iki övladı var.

-qızı **Aləmzər** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1979-cu ildə şəhər orta məktəbini, sonra isə Bakı Yeyinti Sənaye Texnikumunu bitirib. Yoldaşı Fəxrəddin Ağdam rayonundandır.

-oğlu **Zahir** 25 sentyabr 1965-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1982-ci ildə şəhər orta məktəbini, sonra isə Bakı Dəmiryolu Texnikumunu bitirib. Onların Nurlan, Kənan və daha bir övladı var.

## Qarayev Əziz Oruc oğlu



Qarayev Əziz Oruc oğlu 01 iyul 1933-cü ildə rayonun Şamoğlu kəndində anadan olub. 60-cı illərdə rayon mərkəzinə köçmüş və qeyd etdiyim kimi Mehdi kişiyə məxsus evi almışlar. Oruc kişi rəhmətə gedəndən sonra evdə Əziz ailəsi ilə yaşayırdı. Oruc kişinin Qabil adlı bir oğlu da var idi. O orta məktəbi bitirəndən sonra Bakı şəhərinə getdi. Qarayev Əziz Oruc oğlu 10 dekabr 1999-cu ildə Sumqayıt şəhətrində vəfat edib.

## Gəncalıyeva Gümüş Nifti qızı



Yoldaşı Gəncalıyeva Gümüş Nifti qızı 01 iyul 1941-ci ildə rayonun Ağbiz kəndində anadan olub. Rayonun işğalından sonra Sumqayıt şəhərində məskunlaşmışlar

Gümüş Nifti qızı 01 avqust 2013-cü ildə Sumqayıt şəhərində vəfat etmişdir. Onların üç oğlu, iki qızı var.

**-oğlu Rəfael** 02 avqust 1959-cu ildə

rayonun Şamoğlu kəndində anadan olub. Zəngilan şəhər orta məktəbini bitirib. İki övladı var.

**-oğlu Vidadi** 01 dekabr 1961-ci ildə rayonun Şamoğlu kəndində anadan olub. Şəhər orta məktəbini bitirib.

**-qızı Validə** 16 fevral 1962-ci ildə rayonun Şamoğlu kəndində anadan olub. Zəngilan şəhər orta məktəbini bitirib. Bir övladı var.

**-qızı Rahilə** 01 iyul 1964-cü ildə rayonun Şamoğlu kəndində anadan olub. Şəhər orta məktəbini bitirib.

**-oğlu Rövşən** 04 dekabr 1977-ci ildə Zəngilan şəhərində anadan olub. Şəhər orta məktəbini bitirib. İki övladı var.

## Haqverdiyev İsa Murad oğlu



Haqverdiyev İsa Murad oğlu 1930-cu ildə Zəngilan rayonunun İçəri Müşlan kəndində anadan olub. Onların da evi məhəllənin əsas hissəsində idi. 70-ci illərdə onlar da torpaq sahələri çox kiçik olduğundan evlərinin alt hissəsində yeni sahə tutaraq ora köçdülər. Köhnə evi bir müddət saxlasalar da sonra onu Həsənov Sabirə verdilər. O 2013-ilin aprel ayının 11-də Bakı şəhərində vəfat etmişdir.

## Vəliyeva Şəfa Səfər qızı



Yoldaşı Vəliyeva Şəfa Səfər qızı 1933-cü ildə İçəri Müşlan kəndində anadan olub.

Səfa Vəliyeva 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.



O da yoldaşı kimi istehsalatda çalışmış sadə əmək adamlarından olmuşdur. Şəfa Vəliyeva rayonun işğalından sonra 2003 cü ildə Bakı şəhərində dünyasın dəyişmişdir. Onların 4 qızı bir oğlu var.

**-qızı Mahirə** 01 iyul 1955-ci ildə Pirçivan kəndində anadan olub. 1972-ci ildə orta məktəbi bitirib. İşğal ərəfəsində başqa yerdə yaşayırdı. Üç övladı var.

**-qızı Ramilə** 01 iyul 1958-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1975-ci ildə orta məktəbi bitirib. İşğal ərəfəsində başqa yerdə yaşayırdı. Dörd övladı var.

**-qızı Sədəf** 31 dekabr 1960-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1977-ci ildə şəhər orta məktəbini bititib. İki övladı var.

**-qızı Rahilə** 27 sentyabr 1963-cü ildə Zəngilan qəsəbəsində anadan olub. 1980-ci ildə şəhər orta məktəbini bitirib. İşğal ərəfəsində məhəllədə yaşayırdı. İki övladı var.

**-oğlu İsmayıl** 01 aprel 1966-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1983-cü ildə şəhər orta məktəbini bitirib. İşğal ərəfəsində şəhərimizdə sürücü işləyirdi. İki övladı var.

## Suvarma kanalının alt hissəsində, sonralar M. Əzizbəyov küçəsi adlandırılan hissədə yaşayan ailələr

## Qurbanov Şamxal İsmixan oğlu



Qurbanov Şamxal İsmixan oğlu 1917-ci ildə rayonun Şamoğlu kəndində anadan olub. 1941-1945- ci illər vətən müharibəsinin iştirakçısıdr. Uzun illər rayon Mərkəzi xəstəxanasında təsərrrüfat müdiri işləmişdir. Şamxal Qurbanov 2003-cü ildə Bakı şəhərində vəfat etmişdir.

## Qocayeva Bəyim Niyazalı qızı



Yoldaşı Qocayeva Bəyim Niyazalı qızı 1925-ci ildə Orta Yeməzli kəndində anadan olub. O da həyat yoldaşı ilə bərabər rayon Mərkəzi xəstəxanasında uzun illər işləyib. Qocayeva Bəyim Niyazalı qızı 6 uşaq doğub tərbiyə etdiyinə görə I dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub**.** Bəyim Qocayeva 01 dekabr 2010-cu ildə Bakı şəhərində vəfat etmişdir. Onların 3 oğlu, 3 qızı var.

**-oğlu Soltan** 1948-ci ildə Fərəcbəyli kəndində anadan olub. 1954-1964-cü illərdə qəsəbə orta məktəbində oxuyub Evli idi işğal ərəfəsində Rayon Istehlak Cəmiyyətində sürücü işləyirdi. 28 yanvar 2020-ci ildə vəfat etmişdir.

-oğlu **Eldar** 1951-ci ildə Fərəcbəyli kəndində anadan olub. 1958-1966-cı illərdə qəsəbə orta məktəbində oxuyub 8 sinfi bitirdikdən sonra Bakı şəhərinə getmiş, orada təhsilini davam etdirmişdir. Bakı şəhərində yaşayırdı.



İsmixanov Sərdar Şamxal oğlu 1955-ci ildə Samoğlu kəndində anadan olub. 1972–ci ildə şəhər orta məktəbini, hərbi xidmətdən sonra isə Azərbaycan Dövlət Tibb İnstitutunu bitirmişdir. Evli idi işğal ərəfəsində Rayon Hərbi batalyonunda həkim işləyirdi. İşğaldan sonra Bakı şəhərində hərbi Hospitalda həkim işləyən tibb xidmət podpolkovniki Sərdar İsmixanov 2012-ci ildə vəfat etmişdir.

-qızı **Flora** 1950-ci ildə Fərəcbəyli kəndində anadan olub. 1967-ci ildə qəsəbə orta məktəbini bitirib. Evli idi işğal ərəfəsində Daşkəsən şəhərində yaşayırdı.

-qızı **Gülarə** 1953-ci ildə Fərəcbəyli kəndində anadan olub. 1971–ci ildə şəhər orta məktəbini bitirib. Evli idi işğal ərəfəsində

Rayon Əmanət kassasında işləyirdi. Yoldaşı Məmiyev Baratdı.

-qızı **Nazlı** 1958-ci ildə Zəngilan qəsəbəsində anadan olub. 1974-cü illərdə şəhər orta məktəbini sonra isə Azərbaycan Dövlət Tibb İnstitutunu bitirib. Evli idi, işğal ərəfəsində Rayon MX-da həkim işləyirdi.

## Qurbanov Muradxan İsmixan oğlu



Qurbanov Muradxan İsmixan oğlu 1938-cu ildə indiki Zəngilan rayonunun Şamoğlu kəndində anadan olub. 60-cı illərdə rayon mərkəzinə köçmüş 28 Aprel küçəsində şəhərin əsas stadionunun yaxınlığında yer alaraq ev tikmişdilər. Rayonda Kino idarəsində kino mexanik işləyirdi. İşğaldan sonra 1994-cü ildə Bakı şəhərində vəfat etmişdir.

## Qarayeva Dilbər Dünyamalı qızı



Yoldaşı Qarayeva Dilbər Dünyamalı qızı 1942-ci ildə Şamoğlu kəndində anadan olub. O da rayonda yoldaşı ilə bərabər uzun illər rayonun işğalına kimi kino idarəsində kassir işləyirdi. Dilbər xanım rayonun işğalından sonra 2013-cü Bakı şəhərində vəfat edib. Onların iki oğlu, bir qızı var

-oğlu **Yusif** 1959-cu ildə Zəngilan rayonunun Fərəcbəyli anadan olub. İki oğlu bir qızı var. İşğal zaman rayonda sürücü işləyirdi.

-qızı **Xanım** 1960-cı ildə Zəngilan rayonunun Fərəcbəyli kəndində anadan olub. Ailəlidir.



İsmixanov Asif Muradxan oğlu 1962-ci ildə Zəngilan rayonunun Fərəcbəyli anadan olub. 1969-1979-cu illərdə Zəngilan şəhər orta məktəbində oxumuş və oranı bitirmişdir. Orta məktəbi bitirdikdən sonra müxtəlif yerlərdə işləyib. Ailəlidir, iki oğlu var. İsmixanov Asif 2021-ci ildə dünyasını dəyişib.

## İsmixanov Soltan Şamxal oğlu



İsmixanov Soltan Şamxal oğlu 23 dekabr 1948-ci ildə o vaxtkı Qubadlı rayonunun (indiki Zəngilan) Şamoğlu kəndində anadan olub. Onlar ailədə 3 qardaş, 3 bacı olublar. (Soltan, Flora, Eldar, Gülarə, Sərdar, Nazlı) Soltan ailənin ilk övladı idı. Son illərdə bu kənd dağılmışdı İlk təhsilini kənd məktəbində alan Soltan Şamxal oğlu 1959-cu ildə ailəsi ilə birlikdə Zəngilan qəsəbəsinə köçüb. O təhsilini Zəngilan qəsəbə orta məktəbində davam etdirmişdir. 8-ci sinfi bitirdikdən sonra Texniki peşə məktəbində oxuyub.

Soltan Şamxal oğlu 1966-1969-cu illərdə Rusiyanın Saratov şəhərində hərbi xidmətdə olub. O 1970-ci ildə Ermənistan SSR-nin Qafan şəhərində sürücülük kursunu bitirib. Sonrakı illərdə Rayon istehlak cəmiyyətində sürücü işləyib. Rayonun işğalından sonra Sumqayıt şəhərində məskunlaşan İsmixanov Soltan Şamxal oğlu 28 yanvar 2020-ci ildə dünyasını dəyişib.

Övladları bunlardı: **Rövşən** (1974-cü il doğumlu), **Ramin** (1977), **Rasim** (1981), **Ramiz** (1983), **Turab** (1986), **Gülnarə** (1988)

## Cümşlüdlü Əli Seyfulla oğlu



Cümşlüdlü Əli Seyfulla oğlu (Hacı Əli Sobulu) 20 sentyabr 1953-cü ildə Sobu kəndində anadan olub. 1971-ci ildə şəhər orta məktəbini, hərbi xidmətdən sonra isə sonra Azərbaycan Dövlət Universitetinin tarix fakültəsini bitirmişdir İşğal zamanı Rayon İcra Hakimiyyətində işləyirdi.

-yoldaşı **Bəhramova Rahilə Fərzalı** qızı 08 sentyabr 1985- ci ildə Ermənistan SSR-nin Qafan şəhərində anadan olub. Orta təhsillidir.

-oğlu **Kamal** 03 dekabr 1985-ci ildə Zəngilan şəhərində anadan olub. Orta təhsilini Bakıda Zəngilan məktəbində alıb. Sonra İncəsənət Universitetini bitirib. Ailəlidir, Polad adlı oğlu var.

-oğlu **Seyfulla** 19 mart 1989-cu ildə Zəngilan şəhərində anadan olub. Orta təhsilini Bakıda Zəngilan məktəbində alıb. Bakıda I dərəcəli şahmatçıların ustalığa namizəd yarışında I yeri tutmuş və ustalığa namizəd normasını yerinə yetirmişdir.

-qızı **Sevin** 29 dekabr 1990-cı ildə Zəngilan şəhərində anadan olub. Orta təhsilini Bakıda Zəngilan məktəbində alıb, sonra Hollandiyada İqtisadiyyat üzrə Universiteti bitirmişdir. Ailəlidir, Ayla adlı qızı Ayaz adlı oğlu var




**İbrahimov Ayaz Cənnət oğlu** 24 noyabr 2011-ci ildə Hollandiyada anadan olmuşdur. Altı aylıq olanda bəd xassəli şiş xəstəliyinə tutulub. İl yarım müalicə olunsa da heç bir xeyri olmayıb. İbrahimov Ayaz Cənnət oğlu uzun sürən xəstəlikdən sonra 29 oktyabr 2023-cü ildə dünyasını dəyişib.

## Məmmədov Məhəmməd Həsən oğlu

Məmmədov Məhəmməd Həsən oğlu 1933-cü ildə Arazboyu Muğanlı kəndində anadan olub, şəhərimizdə ilk illərdə yeganə Rentgen texniki idi. Bu işi həkimlər qədər bilirdi. Evli idi. Məhəllədə yaşayırdı. İşğaldan əvvəl şəhərimizdə vəfat edib.

Yoldaşı **Məmmədyarova Zümrud Surxay** qızı Genlik kəndində anadan olub. İşğal ərəfəsində rayon SES-də işləyirdi. Zümrud xanım 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.

Onların Fəxrəddin, Zakir adlı oğlu, Ülkər (həkim), Validə və Məhliqa adlı qızları var. İşğal zamanı həmin evdə oğlu Zakir ailəsi və anası ilə birgə yaşayırdı. Onun Emil, Məhəmməd və Ülviyyə adlı üç övladı var.

**Məmmədov Zakir Məhəmməd** oğlu 1959-cu ildə Zəngilan qəsəbəsində anadan olub, şəhər orta məktəbində oxuyub. Sonra Azərbaycan Politexnik İnstitutunu birirmişdir. Ailəli idi və anası ilə birlikdə ata evində yaşayırdı. İşğal ərəfəsində rayon Rabitə Qovşağının rəisi işləyirdi.

Yoldaşı **İsmixanova Nazlı Şamxal qızı** 1958-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Şəhər orta məktəbində oxuyub. Qonşu qızıdır, məhəlləmizdə qonşudan olan yeganə gəlindir. Azərbaycan Dövlət Tibb İnstitutunu bitirmişdir, İşğal ərəfəsində Rayon Mərkəzi Xəstəxanasında həkim işləyirdi. Onların iki övladı var.

## Məmmədov Əli Hilal oğlu

Məmmədov Əli Hilal oğlu rayonun Arazboyu Muğanlı kəndində anadan olub. Uzun illər Rayon İstehlak Cəmiyyətində anbardar, mağaza müdiri vəzifələrində işləmişdir. İşğaldan sonra Bakı şəhərində vəfat etmişdir.

Yoldaşı **Məmmədova Dilarə Həsən** qızı məhəlləmizdə yaşayırdı. Onlarin iki oğlu, iki qızı var.

-qızıları Firəngiz, Şəfirə oğlanları Yusif və Asif.

## Şərifov Niftalı Tacəddin oğlu



Şərifov Niftalı Tacəddin oğlu 1933-cü ilin 22 yanvarında rayonun Seyidlər kəndində anadan olub. Uzun illər rayon yol tikinti təmir idarəsində traktorçu işləmişdir. Niftalı Şərifov bir neçə çağırış Zəngilan şəhər XDS-nin deputatı seçilib. Niftalı Şərifov işğaldan əvvəl 20 noyabr 1992-ci ildə Zəngilan şəhərində vəfat etmişdir.

## Əsədova Sona Musa qızı



Yoldaşı Əsədova Sona Musa qızı (məhəllədə çoxları onu Tamara adı ilə tanıyırdı) 22 oktyabr 1942-ci ildə Qafan şəhərində Pirimli məhəlləsində anadan olub. rayon Daxili Işlər Söbəsində işləyirdi. 05 avqust 1999-cu ildə Bakı şəhərində vəfat etmişdir. Onların iki qızı, üç oğlu var.

-qızı **Nərgiz** 25 oktyabr 1959- cu ildə Zəngilan qəsəbəsində anadan olub. 1976-cı ildə şəhər orta məktəbini bitirib. Orta məktəbi bitirdikdən sonra Bakı şəhərinə getmişdir.

-qızı **Sevda** 21 aprel 1963-cü ildə Zəngilan qəsəbəsində anadan olub 1978 ci ildə şəhər orta məktəbinin 8 sinifini, sonra isə Bakı Mədəni Maarif Texnikumunu bitirib. Sonra ailə həyatı qurmuş və Türkmənstana köçmüşdür. Onların Vüsal (1985) və Anar (1988) adlı iki övladı var.

-oğlu **Nurəddin** 03 yanvar 1966-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1981-ci ildə şəhər orta məktəbini, sonra Bakı Neft Texnikumunu bitirib. Yoldaşı Qarayeva İlhamə Əhliyar qızıdır. Onların Rəşad və Ramin adlı iki övladı var.

-oğlu **Elşən** 03 fevral 1972-ci ildə Zəngilan şəhərində anadan olub. 1989-cu ildə 1 saylı şəhər orta məktəbini bitirib. Sonra Polis şöbəsində işə qəbul olub və torpaqlarımızın müdafiəsində iştirak edib. Müharibə veteranıdır. İşğaldan sonra ailə quran Elşənin Xəyal və Tural adlı iki övladı var. Yoldaşı Şərifova Esmira Eldar qızıdı.

## Şərifov Nadir Niftalı oğlu



Şərifov Nadir Niftalı oğlu 18 iyun 1961-ci ildə Zəngilan qəsəbəsində anadan olub 1978-ci ildə şəhər orta məktəbini bitirib. Orta məktəbi bitirdikdən sonra Bakı şəhərinə gələrək burada 12 saylı Texniki Peşə Məktəbinə daxil olub. 1988–ci ildə Nəzakət Hüseyn qızi ilə evlənib. Onların Rövşən (1989) və Səbinə (1991) adlı iki övladı var. Nadir Şərifov rayon Yol tikinti-təmir idarəsində traktorçu işləyirdi. İşğaldan sonra 15 iyun 2008-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## Musayeva Qəmər



Qəmər Musayeva bildiyimə görə əslən Ağdam rayonundandı. Sovet hakimiyyətinin ilk illərində komsomol fəalı kimi rayonumuza ezam olunub. Sonra həyatını Zəngilanla bağlayıb. O, Zəngilan rayon Komsomol Komitəsinin I katibi işləyib. İlk qadın kommunistlərdəndi. Heydərov Məhəmməd Heydər oğlu ilə ailə qurmuş sonra ayrılmışlar. Müharibə və əmək veteranı olan Qəmər xanım əvvəllər qızı Zenfira və yeznəsi Orucla birlikdə yaşayırdı.

## Əliyev Qurban Musa oğlu



Əliyev Qurban Musa oğlu 1927-ci ildə Pirçivan kəndində anadan olub. Mən onu tanıdığım vaxtlarda Rayon İstehlak Cəmiyyətində idarədə mühasib, müfəttiş işləyirdi. Əliyev Qurban bir zamanlar idarənin partiya təşkilatının katibi, Ticarət İşçiləri Həmkarlar İttifaqı Zəngilan rayon Həmkarlar Komitəsinin də sərdi olub. Əliyev Qurban Musa oğlu işğaldan əvvəl 14 iyul 1984-cü ildə vəfat etmişdir.

## Rzayeva Şərqiyyə Qasım qızı



Yoldaşı Rzayeva Şərqiyyə Qasım qızı 1936-cı ildə Seyidlər kəndində anadan olub. O Tibb Texnikumunu əla qiymətlərə bitirmiş, rayonda SES-də qida laborantı işləmişdir. Şərqiyyə xanım hal hazırda Bakı şəhərində yaşayır. Onların üç oğlu, iki qızları var

-qızı **Rəfayət** (Qurban dayının ilk yoldaşı olan İpək müəllimənin qızıdı) 1950-ci ilin aprelində anadan olub. Rabitə Texnikumunu və Azərbaycan Politexnik İnstitutunu bitirib. Rəfayət xanım 44 il Sumqayıt şəhər Rabitə qovşağında işləyib. Yaxşı işinə görə «Fəxri Fərman» və diplomlarla təltif olunub. Bir oğlu, bir qız var.

-**oğlu Mustafa** 03 iyun 1961-ci ildə anadan olub. Şəhər orta məktəbində oxuyub. Ukraynada Tikinti Texnikumunu bitirib. Bir müddət Krivoy Roq şəhərində işlədikdən sonra vətənə dönüb. Bakı şəhərində yaşayır.

-qızı **Iradə** 1964-cü ilə anadan olub. Şəhər orta məktəbində oxuyub. Azərbaycan Dövlət İncəsənət Universitetinin Mədəni-Maarif fakültəsini bitirib. Rayonda Komsomol komitəsində II

katib işləyib. Həyat yoldaşı Süleymanov Fərman polis mayoru idi. 2012- ci ildə vəfat edib. Oğlu Süleyman atasınnı yolu ilə gedərək Polis akademiyasını bitirib Daxili İşlər orqanlarında işləyir.

-oğlu **Xətai** 26 fevral 1966-cı ildə anadan olub. Politologiya üzrə ali təhsil alıb. Ancaq tikinti sahəsində işləyir. 2005-06-cı illərdə mətbu orqanlar tərəfindən keçirilən müsabiqədə ilin iş adamı seçilib. Hazırda Mənzil Tikinti Kooperativinin sərdi kimi çalışır.

-oğlu **Ceyhun** 1973-cü ildə anadan olub. Ukraynada V.Lazarev adına Dnepropetrovsk Milli Dəmiryolu Universitetini bitirib. Bir neçə il orada çalışdıqdan sonra vətənə qayıdıb. Hazırda Ağ şəhər yaşayış massivində inzibatçı işləyir.

## Bağırov Şamı (Şamil) Kərim oğlu



Bağırov Şamı (əsl adı Şamil idi) Kərim oğlu 1927-ci ildə Pirçivan kəndində anadan olub. İlk təhsilini Pirçivan kənd məktəbinə alıb. 1943-cü idə 16 yaşında Füzuli rayonunda açılan 3 aylıq mühasib kursuna göndərilib. Sonrakı illərdə Şamı dayı həm orta, həm də ki, ali təhsil alıb. O uzun illər rayonumuzda müxtəlif idarələrdə müdür və baş mühasib işləyib. Mən ona məhəlləmizin Karl Marksı deyərdim. İstisadi və maliyyə məsələlərini onun kimi bilən ikinci birini görmədim.

Bağırov Şamı (Şamil) Kərim oğlu işğaldan sonra 2012-ci ildə Bakı şəhərində vəfat etmişdir.

**Məmmədova Şəfiqə Gülüş qızı**



Həyat yoldaşı **Məmmədova Şəfiqə Gülüş qızı** 1934-cü ildə Pirçivan kəndində anadan olub. Tibb Texnikumunu bitirən Məmmədova Şəfiqə Gülüş qızı tibb bacısı idi. Uzun illər rayon Mərkəzi xəstəxanasında işləyib. Məmmədova Şəfiqə Gülüş qızı işğaldan sonra 03 fevral 1997-ci ildə Bakı şəhərində vəfat etmişdir. Onların iki oğlu, iki də qızı var.

-oğlu **Nazim** 28 may 1958-ci ildə Zəngilan qəsəbəsində anadan olub, şəhər orta məktəbini və Azərbaycan Politexnik İnstitutunun Sənaye və Mülki tikinti fakültəisini bitirib. Bir oğlu, bir qızı var.

-qızı **Nəzakət** 1960-cı ildə Zəngilan qəsəbəsində anadan olub, şəhər orta məktəbini əla qiymətlərlə bitirib. Sonra Azərbaycan Tibb İnstitutunun müalicə-profilaktika fakültəsini bitirəndən sonra Zəngilan rayon Mərkəzi xəstəxanasında öz ixtisası üzrə əmək fəaliyyətinə başlayıb. Ailəlidir, Dilbər adlı qızı, Samir adlı oğlu var. Hər ikisi həkimdi.

-qızı **Natəvan** 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub, şəhər orta məktəbini əla qiymətlərlə bitirib. Sonra Azərbaycan Dövlət Universitetinin tətbiqi riyaziyyat fakültəsini bitirib. Ali məktəbi bitirdikdən sonra müddət elmi tədqiqat İnstitutunda işləyib. Hazırda işləmir. Ailəlidir bir oğlu, bir qızı var.

-oğlu **Şahin** 23 dekabbr 1964-cü ildə Zəngilan qəsəbəsində anadan olub, şəhər orta məktəbini bitirib, sonra Bakı şəhərində iqtisadçı mühasib ixtisasını qazanıb. Hərbi xidmətini Moskvada yerinə yetirən Şahin sonra rayon İstehlak Cəmiyyətində və tikinti təşkilatlarında mühasib, baş mühasib işləyib. Ailəlidir, hazırda Bakı şəhərində yaşayır və işləyir.

**Məmmədov Heydər Həsənalı oğlu**



Məmmədov Heydər Həsənalı oğlu 1928-ci ildə Canbar kəndində anadan olub. O 1952-cü ildə hərbi xidmətdən tərxis olunub. Azərbaycan SSR Daxili İşlər Nazirliyinin sərəncamına göndərib. Zəngilanda kitabxanada, sonra altı ay Qafanda meşə təsərrüfatı idarəsində işləyib. 1953-cü ilin avqust ayında Zəngilan rayon DİŞ-də milis nəfəri qəbul edilib, 31 il xidmət edib. Bir neçə medalla, «Fəxri Fərman»larla təltif olunub. Məmmədov Heydər 31 iyul 1984-cü ildə dünyasını dəyişib.

**Ələsgərova Məstan Dünyamalı qızı**

Ələsgərova Məstan Dünyamalı qızı 1929-cu ildə Canbar kəndində anadan olub. Ağdama kolxoz sədri hazırlayan kursa göndəriblər. Kursu bitirib Canbara qayıdıb. Həmişə öz zəhmətsevərli ilə seçilib. Rayon Kom. Komitəsinin büro üzvü, Azərbaycan Komsomolunun qurultay nümayəndəsi olub. «Şərəf nişanı» ordeni, «Rəşadətli əməyə görə Lenin yubiley», «Əmək veteranı» medalları ilə təltif edilib, sosializm yarışının qalibi olub. Məstan xanım 16 may 1998-ci ildə dünyasını dəyişib. Onların bir qızı, üç oğlu var.



**-oğlu Məmmədov Bayram Heydər oğlu** (Milli Ordunun polkovnik-leytenantı) 21 mart 1956-cı ildə Rayonun Canbar kəndində anadan olub. 1978-ci ildə Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutunun İngilis dili fakültəsinin ingilis-azərbaycan dilləri şöbəsini, 1991-ci ildə Bakı Sosial İdarəetmə və Politologiya İnstitutunu və 2009-cu ildə ABŞ Müdafiə Nazirliyinin Hərbi Dil İnstitutunu fərqlənmə

diplomu ilə bitirmişdir. Hazırda Azərbaycan Respublikası MM-də işləyir. Azərbaycan Respublikası Hapkido Federasiyasının vitse prezidenti, Jurnalistlər Birliyinin üzvü və Respublikanın «Əməkdar müəllim»idir. Daima Respublika mətbuatında siyasi, hərbi, elmi və publisist yazıları ilə çıxış edir. Ailəlidir, 3 övladı var. Yazı internetdən götürülüb.

-qızı Səadət 1953- cü ildə rayonun Canbar kəndində anadan olub. 1970- ci ildə şəhər orta məktəbini bitirib. Əlaçı şagird olub.

Eldar Heydər oğlu 1959-cu, Bəxtiyar Heydər oğlu isə 1962-ci ildə anadan olub. Bəxtiyar işğal zamanı milis zabiti idi



**Məmmədli Orxan Bayram oğlu** (Məhəlləmizin dünya və Avropa çempionu)1985-ci ildə Zəngilan şəhərində anadan olub. Rayonun işğalından sonra Bakıda orta məktəbi və Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyasını bitirib. Əlbəyaxa döyüş üzrə 5 qat dünya və 7 qat Avropa çempionu Milli Ordunun ehtiyatda olan zabitidi. **s. 379-381. S. Cavadlı. «Son gümanın Zəngilanım» . Bakı 2011.**

## Rəhimov Tariyel Misirxan oğlu



Rəhimov Tariyel Misirxan oğlu 10 sentyabr 1938-ci ildə Qubadlı rayonunun Cibilli kəndində anadan olub. Sonra Zəngilan qəsəbəsinə köçmüş, burada əmək fəaliyyətinə başlamışdır. O tikinti idarəsində adi fəhləlikdən idarənin müdiri vəzifəsinə kimi yüksəlmişdir. Onu Zəngilanda hamı Umud kimi tanıyırdı. Zəngilanda vəfat edənlər üçün (kim müraciət etmişsə) mişar daşı və sement vermişdir.

Rəhimov Tariyel 13 iyun 2019-cu ildə Bakıda vəfat edib.

Həyat yoldaşı Xanməmmədova Göyçək Xanməmməd qızı 1945-ci ildə Məlikli kəndində anadan olub. Onların Zeynəb, Tamilə, Zinyət adlı qızları, İdris adlı oğlu var.

## Rəhimov İdris Tariyel oğlu



Rəhımov İdrıs Taryel oğlu, 03.11.1965-cı ildə Zənğılanda anadan olub. 1982-ci ıldə Zənğılan şəhər 1-n-li orta məktəbi bitırmış sonra tikintidə və kolxozda fəhlə ışləyib. 1984- cu ildə BDU nin tətbiqi riyazıyyat fakultəsinə qəbul olub, 1985-1987-ci illərdə RF-nın Penza vilayətində hərbi xidmət kecib. 1988-ci ildə İrkutsk Politexnik İn-da Avtonəqliyyat fakültəsində təhsilinə davam edib. 1990- cı ildə Qubadlı r-n Polis Ş-də 1 il xidmət etmiş sonra Zənğilan PŞ-nə dəyışilib. 1994-cu ildə Bakı Inşaat Muhəndisləri Uni-ni, 2001-ci ildə isə Polis Aka-nı bitırib. Polisdə DAM-şi, sahə rəısı, baş təhqıqatcı, QŞVQ-nun baş inspektoru, Xıdmət Uzrə Rəis müavinı işləmiş, 2019-cu ildə öz xahisi ilə polkovnik-leytenant rütbəsində təqaudə çıxıb. Rəhbərlik tərəfindən «Fəxri Fərman» və başqa təltiflər alıb. Zəngilan azad olunanda Agalıda «Agıllı kənd» layihəsı ilə binaların tikintisində AS qrup şırkəti Təhlukəsizlik xidməti rəıs müavini kimi 2023-cü ilin aprelinə kimi ısləyib. Ailəlidir, 2 oğlu, 1 qızı, 3 nəvəsi var.

## Məmmədov Yaqub Sayış oğlu



Məmmədov Yaqub Sayış oğlu 1937-ci ildə Zəngilan rayonunun Muğanlı (Araz kənarı) kəndində anadan olub. Sonra Zəngilan şəhərinə köçüblər. Yaqub dayı uzun illər Zəngilan şəbəkə rayonunda (İşıq idarəsi) sürücü işləmiş-dir. Hayların ərazimizə hücümü zamanı şəhər və kəndlərimizə, insanlarımızla bərabər təsər-rüfatlara, texnikaya, xidmət sahələrinə də xeyli zərər vurmuşlar. Bu dövrdə elektrik xəttləri, transformatorlar və s. zədələnir sıradan çıxırdı. Bunların təmirini də şəbəkə rayonunun işçilərinin üzərinə düşürdü.

O günlərin birində xidməti borcunu yerinə yerirərkən düş-mə-nin atdığı qrad mərmisindən yaralanmışdır. Müalicə olunduq-dan sonra ona II qrup Qarabağ müharibəsi əlili statusu vermişlər.

Məmmədov Yaqub hal-hazırda Bakı şəhəri, Xətai rayonu, K.Kərimov küçəsi 15 c, ünvanda qızı Zəminə ilə birgə yaşayır.

**Mircəfərova Xədicə Seyid Həsən qızı**



Mircəfərova Xədicə Seyid Həsən qızı 1934-cü ildə Zəngilan rayonunun Muğanlı (Araz kənarı) kəndində anadan olmuşdur.

Ailə həyatı qurduqdan sonra Zəngilan şəhərinə köçmüş, uzun illər şəhər 8 illik mək-təbində müəllimə işləmişdir.

Mircəfərova Xədicə Seyid Həsən qızı ra-yonun işğalından sonra Bakı şəhərində vəfat etmişdir.

Onların Mahir, Tahir, Elçin, Səxavət oğlu, Zəminə adlı qızı var.

**Nəbiyev Güllər Bəxtiyar qızı**

Yoldaşı Mehti kişinin əslən haralı olduğunu bilmirəm. 70-ci illərdə Mehti kişi evini Şamoğlu kəndindən gələn Oruc kişiyə sataraq kanalın ait tərəfində özünə yeni torpaq sahəsi alaraq ora köçdü. Yoldaşı Nəbiyeva Güllər Bəxtiyar qızıdı. Onların iki oğlu bir qızı var idi. Mehti kişinin əvvəlki yoldaşından bir qızı və bir oğlu var -oğlu Adıyev Sərdar Mehti oğlu (Mehti kişinin ilk yoldaşından) 1955-ci ildə anadan olub. Şəhər orta məktəbində oxuyub. Bakı şəhərində yaşayırdı. -qızı Nubar 28 aprel 1966-cı ildə Zəngilan qəsəbəsində anadan olub. İşğal zamanı bu evdə Güllər xala oğlu Təhmiraz və qızı Nubar ilə birlikdə yaşayıtrdı.

-oğlu Adıyev Təhmiraz Mehti oğlu 24 may 1962-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Şəhər orta məktəbində oxuyub. İşğal ərəfəsində rayon Yanğından Mühafizə bölməsində

işləyirdi. Adıyev Təhmiraz Mehti oğlu 02 avqust 2014-cü ildə Bakı şəhərində vəfat etmişdir.

Həyat yoldaşı İsmayılova Sənəm Məhərrəm qızı 01 yanvar 1963-cü ildə anadan olub. Onların 2 oğlu var.

Vasif Təhmiraz oğlu 23 noyabr 1987-ci ildə Zəngilan şəhərində anadan olub. Evlidir 3 övladı var.

Mehti Təhmiraz oğlu 28 iyun 1990-cı ildə Zəngilan şəhərində anadan olub. Evlidir 3 övladı var.

## Əliyev Hümbət Musa oğlu

Əliyev Hümbət Musa oğlu 1951-ci ildə anadan olub. Hümbət Musa oğlu 03 noyabr 2005-ci ildə vəfat etmişdir. Həyat yoldaşı Bayramova İntizar 15 avqust 1962-ci ildə anadan olub. -qızı Aytən 26 iyun 1985-ci ildə anadan olub. Ailəlidir.

-qızı Mətanət 29 may 1987-ci ildə, Səadət isə 21 noyabr 1989-cu ildə anadan olub. Hümbətin atası Musa kişi idi. O Suvarma Sistemləri idarəsində işləyirdi.

O işğaldan əvvəl rayonda vəfat etmişdir. Musa kişinin Güllü, Nazilə, Sona adlı üç qızı da var.

İşğal zamanı bu evdə onun yoldaşı Tubulu xala və oğlu Hümbət ailəsi ilə qalırdı.

## İbrahimov Vahid Qasım oğlu.



İbrahimov Vahid Qasın oğlu 05 noyabr 1941-ci ildə Pirçivan kəndində anadan olub. O Yanğından mühafizə idarəsində sürücü işləyirdi.

İbrahimov Vahid Qasın oğlu işğaldan sonra 05.11.2007-ci ildə vəfat etmişdir.

Yoldaşı Müşkünaz x. tibb bacısı idi. Övladları Anar, Aydın, Balaxanım və Sevinc.

## Məmmədov Cümşüd Həsən oğlu

Məmmədov Cümşüd Həsən oğlu 10 yanvar 1938-ci ildə anadan olub. Rayonda sürücü işləyirdi. Yoldaşı Suqra xanımdı. O 19 avqust 1947-ci ildə anadan olmuş. Yanvar 2022-ci ildə vəfat etmişdir. Məmmədov Cümşüd isə avqust 2021-ci ildə vəfat etmişdir. Övladları Vəfa, Gülmirə, Xəyalə və Kəmalə.

## Aslanov Yusif



Aslanov Yusif 1913-cü ildə Keçkili kəndində anadan olmub. Böyük Vətən müharibəsinin iştirakçısı və əlili idi. Yusif Aslanov uzun müddət 2 saylı orta məktəbdə təsərrüfat müdiri işləmişdir. Aslanov Yusif işğaldan sonra 2004-cü ildə Bakı şəhərində vəfat etmişdir.

## Vəliyeva Şahzaman Qoca qızı



Yoldaşı Vəliyeva Şahzaman Qoca qızı Vəlilər kəndində anadan olmuşdir. Əslən Sobu kəndindəndir. İşğaldan sonra 2000-ci ildə Bakı şəhərində vəfat etmişdir. Onların iki qızı, bir oğlu var. Həm Yusif Aslanovun (Əmiraslan), həm də ki Şahzaman (Telman) xalanın əvvəlki evliliklərindən övlatları var idi.

-qızları Zərifə - işğal zamanı Universamda işləyirdi, -qızları Lətifə, -oğlu Aslanov Abasqulu Yusif oğlu 05.dekabr. 1960-cı ildə Zəngilan qəsəbəsində anadan olub. 1978-ci ildə 1 saylı şəhər orta məktəbini bitirib. Həyat yoldaşı Bağdagül. Övladları Günay, Yusif və Bəxtiyar.

## Elnur Əşrəf oğlu Şükürov



Elnur Əşrəf oğlu Şükürov (1 iyun 1974, Bakı – 19 oktyabr 2021, Bakı). BDU-nun Beynəlxalq Hüquq və Beynəlxalq münasibətlər fakültəsini bitirib. 1992-ci ildə «525-ci qəzet»-də jurnalist kimi çalışıb. 1993-cü ildən Az TV-də 16 il işləyib. O, 2011-ci ilin oktyabrında «Space TV»-də idman idarəsinə rəhbər təyin olunub. 2000-ci ildə Azərbaycan MOK üzvü, «Neftçi» FK-nun prezidentinin müşaviri olub. . O, sentyabr ayında koronavirusa yoluxmuşdu. Buna səbəb bir böyrəyinin 10 il əvvəl ağır xəstəliklə bağlı götürülməsi olub. Əvvəl evdə müalicə almış sonra Bakıda «Yeni Klinika»ya köçürülüb. 2021-ci il oktyabrın 19-da koronavirusdan vəfat edib, 20-də Saray qəsəbəsində dəfn olunub. « Ailəli idi, iki övladı var.

https://az.wikipedia.org/wiki/Elnur_%C6%8F%C5%9Fr%C9%99fo%C4%9Flu

P.S. Elnur Əşrəfoğlu haqqınada məlumatı bura əlavə etməyim təsadüfi deyil. O bir başa məhəllədə yaşamasa da evləri məktəbin yanındakı ictimai binada idi. Cavan idi tez dünyadan köçdü.

## Cahangirov Əmiraslan Məlik oğlu



Cahangirov Əmiraslan Məlik oğlu 1928-ci ildə Sobu kəndində anadan olub.2 yaşından atasını itirmiş anası Firuzə xanımla birgə Pirçivan kəndində yaşamışdır. 1961-ci ildə Bakı Maliyyə Kredit Texnikumunu bitirib. Uzun illər Zəngilanda mühasib, baş mühasib işləyib. Əmiraslan dayı 1987-ci ildə Zəngilanda vəfat edib. El təəssübü çəkən kişilərdən olub. İki

oğlu, bir qızı var.

Yoldaşı Kazımova Gülüzar Vəliqulu qızı Pirçivan kəndində anadan olub. Övladları.

-oğlu Fəxrəddin 1951- ci lldə Pirçivan kəndində anadan olub. Yoldaşı Xalidə Cahangir qızıdı. Onların Könül, Şəhla, Vəfa və Nüşabə adlı 4 qızı var.

-oğlu Nurəddin 1955-ci ildə Pirçivan kəndində anadan olub. Azərbaycan Politexnik İnstitutunu bitirib. Yoldaşı Ramilə Cümşüd qızı. Qızları Tamam, Zümrüd, Elnaz, oğlu Tale.

-qızı Validə 1957-ci ilin 15 aprelində Zəıngilan qəsəbəsində anadan olubr. 1974 cü ildə şəhər orta məktəbini, 1981-ildə isə SSRİ-nin 50 illiyi adına Azərbaycan Pedaqoji Xarici Dillər İnstitutu bitirib, Xaliq adlı oğlu və nəvələri var.

## Həsənov Xansuvar Məmi oğlu

Həsənov Xansuvar Məmi oğlu 1933-cü ildə rayonun Malatkeşin kəndində anadan olub. O D. Bünyadzadə adına Azərbaycan Xalq Təsərrüfatı İnstitutunu bitirib. Rayon İstehlak Cəmiyyətində müxtəlif vəzifələrdə çalışıb, İctimai İaşə Birliyinin müdiri olub. Rayonun Ermənistan Res. tərəfindən işğalından sonra Bakıda məskunlıb və 2021-ci ildə vəfat edib. Xansuvar Məmi oğlu Ördəklidən olan Əntiqə adlı xanımla ailə qurub. Ondan bir qızı var. Əntiqə xanım dünyasını tez dəyişib.

Sonra Qarayeva Telli İsfəndiyar qızı ilə ailə qurub. Telli xanım əslən Vənətli kəndindəndir. O uzun illər rayon Mərkəzi Xəstəxanasında tibb bacısı işləyib. Rayonun işğalından sonra Bakı şəhərində məskunlaşmışlar. Onların iki qızı, bir oğlu var. Böyük qızı Arzu həkimdir, oğlu Natiq isə hüquqşünasdı hərbi prokurorluqda işləyir. Son beşik Vəfa isə BDU-nun Beynəlxalq münasibətlər fakültəsini bitirmişdir.

## Hüseynov Fərrux

Hüseynov Fərrux Əhaliyə Məişət Xidməti Kombinatında bərbər işləyirdi. O eyni zamanda oğlan uşaqlarını da sünnət edərdi. İşğaldan əvvəl vəfat etmişdir.

Həyat yoldaşı Şahbəyim xanımdı. Onların Akif (vəfat edib), Əhməd, Asif, Yusif, Rasif adlı oğlanları və bir qızı var.

## Əhmədov Əhməd Səfəralı oğlu



Əhmədov Əhməd Səfəralı oğlu 10 aprel 1932-ci ildə Sobu kəndində anadan olub. Müharibə dövrü Ermənistan SSR-nin Qafan şəhərində yaşamış, sonra Zəngilan şəhərinə köçüblər.. Atası müharibədən qayıtmayan Əhməd ilə kiçik qardaşı Neməti anası böyüdüb. O rayonda dəmiryolunda işləyib. 9 may 2002-ci ildə Bakıda vəfat edib.

-yoldaşı Camalova Tamaşa Xurşud qızı Şamlı kəndindəndi. O Kino idarəsində işləyib. İşğaldan sonra Bakıda məskunlaşmışlar. Onların Ələsgər (dəmiryolu maşinisti işləyib. Vəfat edib), Namiq (mühəndis. Vəfat edib), Mərdan (sürücü) adlı üç oğlu, Əsmər adlı qızları var.

## Camalov Sabir Xurşud oğlu

Camalov Sabir Xurşud oğlu 05 fevral 1944-cü ildə Şamlı kəndində anadan olub. Sonra rayon mərkəzinə köçüb. O tikinti təşkilatlarında işləyib, Sabir 2013-cü ildə vəfat edib.

Yoldaşı Tamara xanım 12 yanvar 1953-cü ildə anadan olub. Əslən Rəzdərə kəndindəndi. Onların Südabə, Solmaz adlı qızları, Habil (hərbçi zabit) və Ramil adlı oğlanları var.

## Allahverdiyev İslam

İslam kişinin də haralı olduğunu bilmirəm. İslam kişi rayon Sanitar Epidemoloji Stansiyasında dezinfektor işləyirdi. İşğaldan əvvəl rayonda vəfat etmişdir.

Yoldaşı Gilə xala Genlik kəndindən idi. Onların da iki qızı üç oğlu var idi. Gilə xala 5 uşaq doğub tərbiyə etdiyinə görə II dərəcəli **«Analıq Medalı»** ilə təltif olunub.

-qızı Leyla işğal zamanı ailəli idi Yeməzli kəndində yaşayırdı.

-oğlu Əmir Pirçivan kəndində anadan olub. Sürücü işləyirdi. İşğal zamanı Bakıda yaşayırdı.

-oğlu Cəmil Zəngilan qəsəbəsində anadan olub. -oğlu Vaqif İşğal zamanı ata evində yaşayırdı.

-bir qızları da var

## Məhəllənin digər sakinləri

28 may və Əzizbəyov küçələrinin sakinləri tək bunlar deyildir. Mən tam məlumat ala bilmədiyim sakinlərin sadəcə adlarını qeyd etməklə kifayətlənirəm. Milis idarəsinin və əmanət bankının yanından şərqə doğru uzanan küçə (ara yol) dəmiryolu vağzalına kimi gedib çıxır. Suvarma kanalının sağ tərəfindəki sakinlər bunlardır. Mədəd taksi sürücüsü, Səkinə (qızı ilə yaşayırdı), Kərimov İsa, Qurbanov Xanlar (yoldaşı Güllü), Bir az şimal tərəfdə İncili qızı Tamara və nəvəsi Nizamədimlə yaşayırdı. Əvvəllər Kərimov Nəriman da burada yaşayıb sonra ictimai binaya köçərək evi qayınanası və oğluna vermişdi, Gülara (Durna xanımın anası) (Burada Hacıağanın da yeri var idi) Balaca, Mehtiyev Yavər (yoldaşı Fərruqa), Qurbanov Nəsir, Əliyev Kamil (yoldaşı Durna), Burada daha bir neçə ailə var ki onların bəzisi digər küçələrə aiddi. Bunlardan Quliyev Qəşəm, Şahmuradpov Şahmurad, Əliyev Zöhrab, Miriyeva Çimnaz (satıcı), taksi sürücüsü Məmməd, Əhmədov Məhiş, Həsənov Həsən, Kərimov Şahsuvar və s.

Buradakı evlərin bəzisi S.Vurğun küçəsinin sakinləri kimi qeyd

olunur. Məsələn Quliyev Qəşəm. Miriyeva Çimnaz və s.

## Məhəllənin tanınmış adamlarından

Bağırov Şamı Kərim oğlu-iqtisadçı
Balaqadaşova Yaqut Seyfulla qızı-musiqi akademiyasını bitirən ilk məhəlləli, beynəlxalq müsabiqələr laueratı
Heydərov Məhəmməd Heydər o- Rayon ZDS İK sədri
Həsənov Allahverən Gülmalı o- Sosialist Əməyi Qəh.
Ismixanov Sərdar Şamxal oğlu-tibb xidmət polk. leytenant
Kərimov Ağa Heydərqulu oğıu-polis polkovnik leytenant
Kərimov Nazir Qibləli oğlu – Raykomun I katibi
Kərimov Şahsuvar Qibləli oğlu-polis mayoru
Məmmədov Yavər Həsən oğlu-həkim, cərrah
Talıbova Mahrux Qəhrəman qızı-Qəhrəman ana
Təhməzova Maya Bəylər qızı-polis polkovnik leytenant
Məmmədov Bayram Heydər oğlu-polkovnik leytenant

## Ordenli qadınlar

Talıbova Mahrux Qəhrəman qızı («Qəhrəman ana»),
İmanova Pustə Xudaverdi qızı (II «Analıq şərəfi» ordeni)
Piriyeva Dilis Hüseynalı qızı (II «Analıq şərəfi» ordeni)

## Məhəlləmizdəki ailələr və onların peşələri

## Müəllimlər

Axundova Xanım Həsən qızı
Bədirxanova Mənsurə Seyfulla qızı-ədəbiyyat
**Kərimova Bənövşə Cəmil qızı -kimya-biologiya**
Cəfərov Aydın Məhəmməd oğlu-rus dili
Cümşüdlü Əli Seyfulla oğlu-tarix

Heydərov Tofiq Məhəmməd oğlu-tarix
Həsənov Qorxmaz Bəylər oğlu-idman
**Xanım müəllimlə, Bəbirin yoldaşı**
İsmixanov Rəşid Kərim oğlu-coğrafiya
**Kərimov Ərəstun Heydərqulu oğlu-hərbi**
**Kərimov Heydərqulu Qibləli oğlu-tarix**
Kərimova Cəmilə Heydərqulu qızı
Kərimova Sonya Heydərqulu qızı
Qocayeva Zöhrə Əli qızı
Ruqiyyə müəllimə-ibtidai sinif
Təhməzova Minayə Bəylər qızı-
Vəliyeva Adilə Qasım qızı-
Vəliyeva Südabə Qasım qızı-
**Zeynəb xala-** ibtidai sinif

## Həkimlər

Cəfərova Aidə Alı qızı, Azər Qocayevin yoldaşı
**İsmixanov Sərdar Şamxal o- kanalın alt hissəsi**
İsmixanova Nazlı Şamxal qızı- kanalın alt hissəsi
Məmmədov Yavər Həsən oğlu, başqa məhəllədə
Məmmədova Səmayə Həsən qızı, Bakıda
Məmmədova Validə Məhəmməd qızı, Genlikdə

## Tibb işçiləri

İsmixanova Sona Kərim qızı
**Qocayeva Bəyim Niyazalı qızı**
**Qocayeva Zəhra Abbas qızı**
**Məmmədov Məhəmməd Həsən oğlu**
Məmmədyarova Zümrüd Surxay qızı
**Əliyeva Məleykə Kərim qızı**
Müşkünaz-Vahid İbrahimovun yoldaşı

## Mühəndislər

Qocayev Azad Əli oğlu
Qocayev Azər Əli oğlu
Məmmədov Fəxrəddin Məhəmməd oğlu
Məmmədov Sabir Həsən oğlu
Məmmədov Zakir Məhəmməd oğlu
Şərifov Fehruz Tacəddin oğlu

## Sürücülər

Allahverdiyev Əmir İslam oğlu- kanalın alt hissəsi
Aslanov Abasqulu Yusif oğlu- kanalın alt hissəsi
Bədirov Davud Seyfulla oğlu
Əliyev Bəxtiyar Həmid oğlu
Haqverdiyev İsmayıl İsa oğlu- kanalın alt hissəsi
Heydərov Rafiq Məhəmməd oğlu
Həsənov Şəhrux Hüseyn oğlu
**Ibrahimov Vahid Qasım oğlu -kanalın alt hissəsi**
**İsmixanov Soltan Şamxal oğlu- kanalın alt hissəsi**
İsmixanov Yusif Muradxan o- kanalın alt hissəsi
**Qurbanov Kərim İsmixan oğlu**
Məmmədov Bəbir Həsən oğlu
Məmmədov Cümşüd Həsən o- kanalın alt hissəsi
Məmmədov Yaqub Sayış oğlu- kanalın alt hissəsi

## Traktorçular

Şərifov Niftalı Tacəddin oğlu- kanalın alt hissəsi
Şərifov Nadir Niftalı oğlu- kanalın alt hissəsi

## Aqronomlar

**Bağırov Hidayət Məmiş oğlu**
**Əliyev Həmid Hadı oğlu**
Heydərov Bəxtiyar Məhəmməd oğlu

## Tikinti mühəndisləri

Heydərov İlqar Məhəmməd oğlu
**Həsənov Mürvət Hüseyn oğlu**
**Qocayev Əli Eyvaz oğlu**

## Digərləri

**Həsənov Bəylər Bəhmən oğlu-maliyyə işçisi**
**Vəliyev Əliş-bank əməliyatçısı**
**Məmmədov Əli Hilal oğlu-ticarət işçisi**
**Əliyev Qurban Musa oğlu-mühasib**

## Məhəlləmizdə mənim gördüyüm vəfat edən insanlar

1. Axundov Həsən Məhəmməd oğlu
2. Bağırov Hidayət (Bakıya köçmüşdü)
3. Bədirxanov Seyfulla Cümü oğlu
4. Cəfərov Məhəmməd Qədir oğlu
5. Cümşüdova Mənsimə Seyfulla qızı
6. Gülcahan xala
7. Həsənov Allahverən Gülmalı oğlu
8. Həsənov Hüseyn
9. İsmixan kişi, Qurbanov Şamxalın atası
10. Məmmədov Məhəmməd Həsən oğlu
11. Musa
12. Ramazanova Hürüxan Xanməmməd q (nənəm)

13. Şərifov Niftalı Tacəddin oğlu
14. Vəliyev Qasım Eyvaz oğlu
15. Zeynəb xala
16. Cümşüdova Filyar Seyfulla qızı (1950-1959)
17. Əliyeva Nigar Həmid qızı
18. İsmixanova Məstan Kərim qızı

## İşğaldan sonra vəfat edənlər

1. Bədirxanova Şüşə Kamal qızı
2. Cəfərov Səfiyar Cəfər oğlu
3. Cəfərova (Sadıqova) Gülşən Zeyqəm q
4. Əhmədova Telli İbiş qızı
5. Əliyev Həmid Hadı oğlu
6. Əliyev Hümbət Musa oğlu
7. Həsənov Bəylər Təhməz oğlu
8. Həsənov Mürvət Hüseyn oğlu
9. Həsənov Sabir Allahverən oğlu
10. Xanım muəllmə, Bəbirin yoldaşı
11. İmanova Püstə Xudaverdi qızı
12. İsmixanov Rəşid Kərim oğlu
13. İsmixanov Sərdar Şamxal oğlu
14. İsmixanov Soltan Şamxal oğlu
15. Kərimov Ağa Heydərqulu oğlu
16. Kərimov Ərəstun Heydərqulu oğlu
17. Kərimov Heydərqulu Qibləli oğlu
18. Kərimov Nəzir Qibləli oğlu
19. Kərimov Sahsuvar Qibləli oğlu
20. Kərimova Bənövsə Cəmil q- müəllimə
21. Qarayev Əziz Oruc oğlu
22. Qocayev Əli Eyvaz oğlu
23. Qocayeva Bəyim Niyazalı qızı
24. Qocayeva Zəhra Abbas qızı

25. Qurbanov Kərim İsmixan oğlu
26. Qurbanov Muradxan İsmixan oğlu
27. Qurbanov Şamxal İsmixan oğlu
28. Məmmədov Əli Hilal oğlu
29. Piriyeva Diliş Hüseynalı q
30. Talıbova Mahrux Qəhrəman qızı
31. Vəliyev Azər Əliş oğlu
32. Vəliyev Əliş Səfər o
33. Vəliyeva Aidə Qasım qızı
34. Vəliyeva Şəfa Səfər q
35. Əliyev Yusif Həmid oğlu
36. İsmixanov Asif Muradxan oğlu
37. Şərifov Feyruz Tacəddin oğlu

## İşğala kimi məhlləmizdə hansı adlar var idi

*(1993-cü ilə kimi doğulanlar)*

Adilə Qasım qızı (başqa məhəllədə)
**Ağa Heydərqulu oğlu**
Aidə Alı qızı (gəlin)
Aidə Əkbər qızı (gəlin)
Aidə Qasım qızı
Akif Sabir Həsənovun oğu
Aləmzar İsmayıl qızı
**Allahverən Gülmalı oğlu**
Anar Fehruz oğlu
Asif Əli oğlu
**Asif Muradxan oğlu**
Asya Sabir Həsənovun yoldaşı
Ayaz Əli oğlu
Aybəniz Azər Qocayevin qızı
Aydın Məhəmməd oğlu
Aytən-Hümbətin qızı

Azad Əli oğlu
Azər Əli oğlu
**Azər Əliş Vəliyevin oğlu**
Bəbir Həsən oğlu
Bəhmən Bəylər oğlu (Rusiyada)
Bəhram Bəylər oğlu (Rusiyada)
Bəxtiyar Həmid oğlu
Bəxtiyar Məhəmməd oğlu (Malatkeşində yaşayırdi)
**Bənövşə müəllimə**
**Bəyim Qocayeva**
Bəyim Sərdar qızı (uşaq)
**Bəylər Bəhmən oğlu**
Ceyhun Qurban Əliyevin oğlu
Cəmilə Heydərqulu qızı
Cümşüd Həsən oğlu
Davud Seyfulla oğlu
**Diliş xala-Həmid Əliyevin yoldaşı**
Durna-Ərəstun Kərimovun qızı
Elnarə-Mürvət Həsənovun qızı
Elnur-Mürvət Həsənovun oğlu
Elşad Tofiq oğlu Heydərov
Elşən Niftalı oğlu
Elvin- Bəxtiyar Əliyevin oğlu
Ədalət Hidayət oğlu
Ədil Səfiyar oğlu
**Əli Eyvaz oğlu**
**Əli Hilal oğlu**
Əli Seyfulla oğlu
**Əliş Vəliyev**
**Ərəstun Heydərqulu oğlu**
**Əziz Oruc oğlu**
**Fehruz Tacəddin oğlu**
Fəxrəddin Məhəmməd oğlu

Fərqanə Əliş Vəliyevin qızı
Fərqanə- Şəhrux Həsənovun qızı
**Filyar Seyfulla qızı (şagird 1950-1959)**
Firəngiz Əli qızı
Flora Şamxal qızı (başqa şəhərdə)
Gülarə Şamxal qızı (başqa kənddə)
**Gülcahan xala**
Gülgəz-Şəhrux Həsənovun yoldaşı
Güllər Səfiyaq qızı
Güllü Musa qızı (başqa yerdə)
Gülnar Azər Qocayevin qızı
Gülnarə Əliş Vəliyevin qızı
Gülşən Zeyqəm qızı Aydın müəllimin yoldaşı (gəlin)
Günel-Bəxtiyar Əliyevin qızı
Heydərqulu Qibləli oğlu
Həmid Hadı oğlu
Həsən Bəbir oğlu (uşaq)
**Həsən Məhəmməd oğlu**
**Hidayət Bağırov**
Hümbət Musa oğlu
**Hüseyn dayı**
Hüseyn Mürvət oğlu (uşaq)
**Xalidə Səfiyar qızı (başqa məhəllədə)**
Xanım Həsən qızı
Xanım Muradxan qızı
Xanım Nərimanın yoldaşı (gəlin)
**Xanım, Bəbir Məmədovun yoldaşı (gəlin)**
Xətai Qurban Əliyevin oğlu
İlham Əliş Vəliyevin oğlu
İlhamə Fehruz qızı
İlqar Fehruz oğlu
İlqar Məhəmməd oğlu (Malatkeşində yaşayırdı)
İnqilab Kərim oğlu

İntizar-Hümbətin yoldaşı-gəlin
İradə- Qurban Əliyevin qızı
İsa Haqverdiyev
İsmayıl- İsa Haqverdiyevin oğlu
İsmayıl Mehti oğlu Quliyev
Kamal Əli oğlu (uşaq)
Kərim Ismixan oğlu
Kifayət İsa qızı (başqa şəhərdə)
**Qasım Eyvaz oğlu**
Qəndili Hüseyn qızı (başqa məhəllədə)
Qiymət İsmayıl qızı, Sərdar həkimin yoldaşı (gəlin)
Qorxmaz Bəylər oğlu
**Qurbanov Şamxal Ismixan oğlu**
Lətifə Əliş Vəliyevin qızı
Mahir İsmayıl oğlu
Mahirə İsa qızı (başqa şəhərdə)
**Mahrux Talıbova, Qəhrəman qızı**
Maya Bəylər qızı (Bakıda)
**Mədinə Əliyeva**
**Məhəmməd Həsən oğlu (1933-1988)**
**Məhəmməd Qədir oğlu**
Məhəmməd Zakir oğlu
Məhsəti Aydın qızı
Məleykə-Əliş Vəliyevin yoldaşı
**Mənsimə Seyfulla qızı (başqa kənddə 1947-1992)**
Mənsurə Seyfulla qızı (başqa məhəllədə)
Məstan Kərim qızı
Məstan-milis Heydərin yoldaşı
Mətanət-Hümbətin qızı
Minayə Bəylər qızı (başqa məhəllədə)
Mirvari Həmid qızı (başqa yerdə)
Murad- Şəhrux Həsənovun oğlu
**Muradxan İsmixan oğlu**

**Musa- Hümbətin atası**
Mustafa Qurban Əliyevin oğlu
**Mürvət Hüseyn oğlu**
**Nadir Niftalı oğlu**
Nailə Səfiyar qızı (başqa yerdə)
Natəvan Aydın qızı (uşaq)
Natəvan Şamil qızı
Nazilə Musa qızı (başqa yerdə)
Nazim Şamil oğlu
**Nazir Qibləli oğlu**
Nazlı Şamxal qızı
Nərgiz- Mürvət Həsənovun yoldaşı
Nərgiz Niftalı qızı
Nəriman Səfiyar oğlu
Nəsimi Aydın oğlu
Nəzakət İsmayıl qızı
Nəzakət Şamil (Şamı) qızı
Nəzakət -Nadir Niftalı oğlunun yoldaşı (gəlin)
Niftalı Tacəddin oğlu
**Nigar Həmid qızı (şagird 1955-1966 )**
Nilufər Sərdar İsmixanovun qızı (uşaq)
Nisə Həmid qızı (Daşkəsən rayonunda)
Nurəddin Niftalı oğlu
Polad Tofiq oğlu Heydərov
**Püstə xala**
Radif -Sabir Həsənovun oğlu.
Rafiq Məhəmməd oğlu (Malatkeşində yaşayırdı)
Rahilə Əziz Qarayevin qızı
Rahilə Fərzalı qızı, Cümşüdlü Əlinin yoldaşı (gəlin)
Rahilə- İsa Haqverdiyevin qızı
Ramilə (gəlin)-Bəxtiyar Əliyevin yoldaşı
Ramilə İsa qızı (başqa şəhərdə)
Rəfael Əziz oğlu

Rəfayət Qurban Əliyevin qızı
Rəşid Kərim oğlu
Rövşən Əziz oğlu
Rövşən-Nadir Şərifovun oğlu
Ruqiyyə müəllimə
Sabir Allahverən oğlu
Sabir Həsən oğlu
Sabir Hidayət oğlu
Sahibə- Əliş Vəliyevin qızı
Saleh Həmid oğlu
Samirə- Şəhrux Həsənovun qızı
Sevda Niftalı qızı
Sevin Əli qızı (uşaq)
**Seyfulla Cümü oğlu (1923-1986)**
Seyfulla Əli oğlu
**Seymur-Ərəstun Kərimovun oğlu**
Səbinə, Nadir Şərifovun qızı
Sədəf İsa qızı
**Səfiyar Cəfər oğlu**
Səmayə Həsən qızı
**Sərdar Şamxal oğlu**
Sima -Bəxtiyar Əliyevin qızı
Solmaz Səfiyar qızı
Soltan Şamxal oğlu
Sona Kərim qızı
Sona Musa qızı
Sona- Şərifov Niftalının yoldaşı (gəlin)
Sonya Heydərqulu qızı
Südabə Qasım qızı
Şahin Şamil oğlu
**Şahsuvar Qibləli oğlu (başqa məhəllədə)**
**Şəfa Vəliyeva**
Şəfiqə Əli qızı

Şəhla Hidayət qızı
Şəhrux Hüseyn oğlu
Şəndə xala- Bağırov Hidayətin anası
**Şüşə Kamal qızı**
**Tacəddin kişi**
Tahir İsmayıl oğlu
Tahir Yaqub oğlu
**Telli xala**
Telli- Şəhrux Həsənovun qızı
Tofiq Məhəmməd oğlu
Tubulu xala
Tural Nəriman oğlu
Ülkər Məhəmməd qızı (başqa yerdə)
Vahid Həmid oğlu
**Vaqif Səfiyar oğlu Cəfərov (1949-1969)**
Validə Əziz qızı Qarayeva
Validə Məhəmməd qızı (başqa yerdə)
Vidadi Əziz oğlu
Yaqut Seyfulla qızı
Yavər Həsən oğlu
Yusif Əli oğlu
Yusif Muradxan oğlu
Zahir İsmayıl oğlu
Zakir Hidayət oğlu
Zakir Məhəmməd oğlu
**Zeynəb, Kərimov Heydərqulunun yoldaşı (gəlin)**
**Zəhra Abas qızı Qocayeva**
Zümrüd Surxay qızı- M. Məmmədovun yoldaşı (gəlin)

***Qara rəngli yazılanlar işğaldan qabaq, kusivlə olanlar isə işğaldan sonra vəfat edənləri bildirir**

**СРЕДНЕВЕКОВЫЕ ИСТОРИЧЕСКИЕ ИСТОЧНИКИ ВОСТОКА И ЗАПАДА**

Главная А Б В Г Д Е Ж З И Й К Л М Н О П Р С Т У Ф Х Ц Ч Ш Э Ю Я Документы

ХАМДАЛЛАХ КАЗВИНИ

УСЛАДА СЕРДЕЦ

**НУЗХАТ АЛ-КУЛУБ**

(Материалы по Азербайджану)

ЗАНГИЙАН. В его округ входит несколько селений, однако все они в настоящее время числятся за округом Мардан Наким. Поблизости от Зангийана находится мост Худа-Афарин через реку Араке, доторый был построен в 15 году хиджры (636 г.) Бакром ибн Абдаллахом, одним из сподвижников пророка Мухаммада, да благословит его Аллах и да приветствует!

(пер. З. М. Буниятова и И. П. Петрушевского)

Текст приводится по изданиям: Йакут-ал-Хамави. Му’джам ал-Булдан. (Сведения об Азербайджане). Хамдаллах Казвини. Нузхат-ал-кулуб. (Материалы по Азербайджану). Баку. Элм. 1983

© текст - Буниятов З. М., Петрушевский И. П. 1983

© сетевая версия - Thietmar. 2002

© дизайн - Войтехович А. 2001

© Элм. 1983

https://www.vostlit.info/Texts/rus/Kazvini_Chamdallach/frametext1.htm

**Zəngilanın yaranması tarixi ilə bağlı bir məlumat.**

Son illərdə Zəngilanla aid çap olunan kitablarda yazılıb ki, Zəngilanın (söhbət kənd Zəngilandan gedir) əsası 636-cı ildə qoyulub. Mənbə kimi də Həmdullah Qəzvinin bu kitabını əsas gətirirlər. Adı çəkilən kitabındakı məlumat yuxarıdakı kimidi. Burada Zəngilanın 636- cı ildə salınması barədə bir məlumat yoxdu. 636-cı il Xudafərin körpüsünün salınması tarixidir. Əslində bu körpülərin tarixi lap qədimdi. Bu məlumata mənim münasibətim belədi ki, Zəngilanın tarixi eramızdan əvvələ gedib çıxır, 636-cı ilə yox. Zəngilanın ən azı 2500 illik bir tarixi var

# ƏLAVƏLƏR

## Pirçivan

Məhəllədən danışarkən Pirçivandan (indiki Zəngilan şəhəri) bəhs etməsək olmaz. Çünki bu məhəllə Pirçivanın kiçik bir hissəsidi. Pirçivan kəndi indiki Zəngilan şəhərinin əvvəlki adıdı. Azərbaycanda sovet hakimiyyəti qurulandan sonra düz on il yeni quruluş olan sovet hökuməti ölkəni Azərbaycan Xalq Cümhuriyyətinin (1918-1920-ci illər) inzibati bölgüsü əsasında idarə etdi. 1930- cu ildə isə burada yeni inzibati ərazi vahidləri olan rayonlar yaradıldı. Zəngilan rayonu 1930-cu ilin avqust ayında təşkil olunandan sonra rayon mərkəzi kimi ilk olaraq kənd Zəngilan seçildi. Lakin həmin il burada malyariya xəstəliyi baş verdiyindən mərkəz Pirçivan kəndinə köçürülüb. Ola bilsin ki, xəstəlik olmasaydı da rayon mərkəzi Pirçivana köçürüləcəkdi. Çünki kənd Zəngilanın ərazisinə baxanda Pirçivan daha perspektivli sayılırdı. Pirçivan toponiminə geniş izah vermək fikrində deyiləm. Qısası deyim ki, bu ad ərazidəki Pirlə bağlıdı. Pirçivan sözünün kökündə pir sözü var. Kəndin qarşısında dağın təpəsində olan pir yerli əhalinin ziyarət etdiyi yerlərdən biridi. Çox güman ki, bu ziyarət yeri Islam dinindən də əvvəl mövcud olub. Kənd deyərdim ki, qədim yaşayış məskənidir. Çünki, kəndin ərazisi həm karvan yollarının kəsişdiyi yerdə yerləşməklə yanaşı, həm də ki, ətrafı çox da hündür olmayan dağlarla əhatə olunub. Bu hündürlüklərdən karvanların işarə verilməklə qəbulu və yola salınması üçün istifadə edilirdi. Keçmişdə və eləcə də orta əsrlərdə karvanlar uca dağlardan məşəllə işarə verilməklə qəbul olunub yola salınardı. Çünki müəyyən yerlərdə həm karvanlar dincələr, həm də ki, bəzi mallar mübadilə edilərdi. Pirçivan kəndi iki hissədən ibarətdir. Birinə köhnə Pirçivan, əsas hissəyə isə sadəcə Pirçivan deyilib. Əsas hissə Zəngilan şəhərinin Məscid düzü deyilən yerdə, köh-

nə Pirçivan isə şəhərimizi bu hissə ilə ayıran dərənin (son illərdə orada yerləşən Maşın Traktor Stansiyasının (MTS) şimal tərəfində, ona müharibə illərində kombinat dərəsi də deyilirdi) şimal tərəfindəki hissə idi. Son illərdə köhnə Pirçivan yaşayış massivi buradan «Çeşməgözü»nə kimi olan geniş bir ərazini əhatə edirdi. Niyə ora köhnə Pirçivan deyilirdi. Bu «köhnə» ifadəsi qədim yox, evlərin nimdaşlığı səbəbindən köhnə adlanırdı. Çünkü əgər Məscid və kəndin bəylərinin şəxsi evləri əsas hissədə yerləşirdisə, köhnə Pirçivan qədim ola bilməzdi. Çox güman ki, köhnə Pirçivanda bəylərin təsərrüfatında işləyən əhali yaşayır və orada da qalırdılar. Əsas hissədə də bəylərin xidmətçiləri yaşayırdı. Bir yerin qədimliyini  tarixi memarlıq abidələri və epiqrafik (yazılı daşlar, kitabələr) abidələrlə müəyyən edərlər. Təbii ki, əlimizdə elə yazılı kitabələr yoxdur.

Biz qəbiristanlıqlara əsasən fikir yürüdə bilərik. Əsas hissədə suvarma kanalının keçdiyi yerdə, (Milis şöbəsinin köhnə binasının şərq hissəsində, şəhərin ilk hamamlarından biri olan ərazidə) qədim bir qəbiristanlıq qalıqları aşkar edilmişdir. Bu ərazidə 1960-61-ci illərdə yeni bazarın tikintisi üçün traktorla planlama işləri aparılarkən insan kəlləsi və digər sümüklər üzə çıxmışdı. Bu ərazidə sovet hakimiyyətinin ilk illərində inşa edilmiş kiçik gücə malik GES-in (Su Elektrik Stansiyası) işlədilməsi üçün kanal çəkilmişdi. Kanal demək olar ki, lap qəbiristanlığın ortasından keçib gedirdi. Mən özüm bu hadisənin şahidiyəm. Onu deyə bilərəm ki, bu qəbirisrtanlıqda heç bir yerüstü iz yox idi. Qəbiristanlıq Pirçivanın qədim yaşayış yeri olduğunu göstərir.

Rusiya İmperiyası zamanındakı inzibati bölgüyə əsasən Pirçivan 19- cu kənd dairəsinə daxil edilib. Bu dairədə Genlik, Malatkeşin, Pirçivan və Şəhərcik (Tağlı) adlı kəndlərdəki evlərin sayı (tüstü deyilirdi), əhalisi (kişi və qadınlar ayrı-ayrılıqda) barədə məlumat verilir. 1886-cı ilə aid olan bu statistik məlumatlar 1893-cü ildə Tiflisdə bir hayın (erməninin) mətbəəsində çap olunub.

| N | KƏNDLƏR | Tüstü | Kişi | Qadın | Cəmi |
|---|---|---|---|---|---|
| | Pirçivan k.icması | 271 | 664 | 525 | 1189 |
| 1 | Genlik | 85 | 175 | 143 | 318 |
| 2 | Malatkeşin | 115 | 315 | 250 | 565 |
| 3 | Pirçivan | 50 | 121 | 90 | 21 |
| 4 | Şəhərcik 2 (Tağlı) | 23 | 55 | 42 | 95 |

**Bax: Свод статистических данных о населении Закавказскаго края, извлеченных из посемейных списков 1886 г. [Текст] / издан по распоряжению Главноначальствующаго гражданскою частию на Кавказе Закавказским статистическим комитетом. - Тифлис : Тип. И. Мартиросиянца, 1893. - XV, [899], 52 с. : табл.; 26 см**

Bu məlumatdan görünür ki, Pirçivanın əhalisi 1893-cü ildə Kenlik və Malatkeşin kəndlərinin əhalisindən az idi. Rayon mərkəzi təsdiq olunandan sona Pirçivan kəndi surətlə böyümüş və gözəl bir şəhərə çevrilmişdiur. Düz yüz il sonra 1993- cü ildə onun əhalisi10 min nəfərə yaxın idi.

Pirçivan Oxçuçayın sağ sahilində düzənlikdə yerləşir. Onun qərb tərəfində alçaq təpəlilkər, Şərq tərəfini isə Oxçuçayı əhatə edir. Kəndin həm cənub, həm də ki, şimal hissələrində olan təpəliklər ərazini sanki hər iki tərəfdən qapayır. İnqilabdan əvvəlki Pirçivan o qədər də böyük olmayıb. Zəngilan rayon kimi təsdiq olunandan sonra bu kənd rayon mərkəzi kimi təsdiq olunur və Zəngilan adlandırılır. Mövcud qanuna görə rayon mərkəzi ilə rayonun adı eyni olmalı idi. 1957-ci ildə Zəngilana qəsəbə, 1967-ci ildə isə şəhər  statusu verildi.

## Onları bir daha xatırlayaq

Məhəlləmiz Zəngilanın kiçik bir hissəsi olsa da önəmli bir yerdə idi. Sadə peşə adamları ilə yanaşı rayonun rəhbər kadrları da məhəllədə yaşayıblar. Sovet kökümətinin ən önəmli təşkilatlarından olan komsomol yerli sovetlər və partiya komitəsi rayonu idarə edirdi. Rayon rəhbərliyində olan məhəllə sakinləri .

Heydərov Məhəmməd Heydər oğlu rayonun ilk komsomol katiblərindən, rayon ZDS İK-nin sədrlərindən biri olmuşdur. (Kitabda onun özü və ailəsi barədə məlumart səh 43-də )

Talıbova Mahrux Qəhrəman qızı məhlədə yeganə «Qəhrəman ana» (bax səh-38), Həsənov Allahverən Gülmalı oğlu (Bax səh 42 ) isə Sosialist Əməyi Qəhrəmanı adı alıb.

Məmmədov Məhəmməd Həsən oğlu (1933-1988) (Məlumat səh 55-də) isə rayonumuzun ilk rentgön texniki olub. O uzun illər bu işi təkbaşına görmüşdür. Orta ixtisas təhsili olmasına baxmayaraq o bu işi həkimlərdən yaxşı bilirdi.

Sadə peşə adamlarından Cəfərov Səfiyar Cəfər oğlunun və Əsgərov Eldar Qulam oğlunun yaxşı işləri qeyd edilmiş, şəkilləri rayonun «Şərəf lövhəsi» nə vurulmuşdur.

## Kərimov Nəzir Qibləli oğlu



Kərimov Nəzir Qibləli oğlu 21 dekabr 1928-ci ildə rayonun Yusiflər kəndində anadan olmuşdur. 1937-ci ildə Şayıflı kənd orta məktəbinə getmiş, 1947-ci ildə isə Pirçivan qəsəbə orta məktəbini bitirmişdir.

Azərbaycan LKGİ Zəngilan rayon Komitəsinin 25 dekabr 1952-ci il tarixli Plenimunda onu rayon Komsomol Komitəsinin I katibi

seçirlər. 1961-ci ilin avqustun 10-da Rayon partiya Komitəsinin Plenimu onu Raykomun II katibi seçir. 1963-cü ildə Zəngilan rayon ZDS İK-nin sədrliyi Nəzir Kərimova həvalə edilir. Həmin sessiyada Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin sədri M.Ə.İskəndərov iştirak etdi. Az. KP Zəngilan rayon PK-nın 11 oktyabr 1968-ci il tarixli plenimunda Kərimov Nəzir Plenimun qərarı ilə Raykomun I katibi təsdiq olunur və 1979- cu ilə kimi bu vəzifədə işlədi. O Bir neçə çağırış Azərbaycan SSR Ali Sovetinə deputat seçilib.

Kərimov Nəzir Qibləli oğlu 07 iyun 2011-ci ildə Bakı şəhərində vəfat etmişdir.

## ZƏNGILAN HAQQINDA YAZILMIŞ ŞEİRLƏR

Kitabın sonuna bir yazını əlavə etməyim təsadüfü deyil. Məhəlləmiz Zəngilanın kiçik bir hissəsidi. İstədim ki, Zəngilan barədə yazılmış şeirləri də bura əlavə edim. Bu diyar bizim dünyaya göz açdığımız, havasını udub, suyunu içib, bərəkətli torpaqlarında yetişən nazi nemətini yediyimiz bir yerdi. Şeirləri müəlliflərin yaşına görə düzdüm. Zəngilan haqqında 50-ci illərdə bir mahnı var idi. «Ana gedirəm Zəngilana». Onu Zülfü Adıgözəlov oxuyub. (O 1898-ci ildə Şuşanın Qaradolaq kəndində anadan olub.. Şuşada muğam axşamlarından birində onu dinləyən Cabbar Qaryağdı oğlu onu Bakıya dəvət edir. 1927-ci ildə Bakıya gəlib «Müdafiə evi»ndə işləmək üçün Ü. Hacıbəyov, Qurban Pirimov, M.Maqomayev (müğənni Müslümün babası) və b. qarşısında imtahan vermiş, eyni zamanda radio verilişləri komitəsinə işə qəbul olunub. O 1963-cü ildə Bakıda vəfat etmişdir) Mahnının sözləri kimindi bilmədim. Asif Bağırovun dedikləri:

Bu mahnını Cabbar Qaryağdıoğlu (Cabbar İsmayıl oğlu Qaryağdıoğlu (31 mart 1861, Şuşa – 20 aprel 1944, Bakı)- xanən-

də, bəstəkar, musiqi xadimi, Azərbaycan SSR xalq artisti (1935). xanəndəlik sənətinin ən görkəmli nümayəndələrindən biri) yazıb. Zülfü Adıgözəlovun səsinə uyğun olduğundan mahnını onun oxumasını istəyib. 1961-ci ilin sentyabrında Zəngilanda musiqi məktəbi açıldı. Onun ilk direktoru Naxçıvandan olan Tapdıq Bağırov idi. Bu dövrdə Nəriman müəllim bir şeir yazmış və Tapdıq müəllim də ona musiqi bəstələdi. Mahnının ilk ifaçısı Məleykə Həsənxan qızı Azadova olub. Uşaqdan böyüyə hamı onu zümzümə edirdi. Bu şeirdən ilham alaraq sonrakı illərdə Zəngilana həsr olunmuş onlarla şeirlər yazıldı. Mən onları toplayıb kitaba əlavə etmək istədim. Fikrimi Asif Bağırova deyəndə mənə dəstək verdi o şeirləri mənə yolladı. Şeirlərlə bərabər müəllifləri də yada salaq. 80-ci illərdə Zəngilan barədə bəstəkar Bəxtiyar Kərimov daha bir mahnı bəstələdi.

## Kərimov Bəxtiyar Müseyib oğlu



Kərimov Bəxtiyar Müseyib oğlu 1929-cu ildə Turabad kəndində anadan olub.. Mincivan kənd məktəbində oxuyub. Sonra Asəf Zeynallı adına musiqi məktəbin bitirib. Ü.Hacıbəyov ona maddi-mənəvi dəstək olub. Sonrakı illərdə Moskvada və Leninqradda da musiqi təhsili alıb. Ömrünün sonuna kimi A.Zeynallı adına musiqi məktəbində dərs deyib.

Kərimov Bəxtiyar iyul 1997-ci ildə vəfat etmişdir. Onun Zəngilanım mahnısını E.Rəhimova ifa edib. **s.362-363. S. Cavadlı Son Gümanım Zəngilanım.**

Z.Adıgözəlovun oxuduğu «Mən gedirəm Zəngilana» mahnısının mətninin bir hissəsi

*Mən gedirəm Zəngilana*
*Ay ana-ana, günləri sana*
*Gedirəm axı, gedirəm axı*

*Mən aşiqəm bir ceyrana*
*Ay ana-ana, günləri sana*
*Gedirəm axı, gedirəm axı*

*Elçilərim yol üstədir*
*Hər nə desən göz üstədir*
*Ana, yarım gözəl-göyçək*
*Dodaqları köz üstədir*

*Ay ana-ana günləri sana*
*Gedirəm axı, gedirəm axı*
*Mən gedirəm qəm eyləmə*
*Ay ana-ana, günləri sana*

*Gedirəm axı, gedirəm axı*
*Kipriklərin nəm eyləmə*
*Ay ana-ana, günləri sana*
*Gedirəm axı, gedirəm axı*

Zülfü Adıgözəlovun oxuduğu mahnı bir nisgil, bədbinlik təsiri bağışlayır. Mahnıdan görünür ki, o sanki gedər gəlməz yerə, qaranlığa döğru gedir. N. Əliyevin yazdığı şeirdə isə işıq, gələcəyə inam, sevinc motivləri daha güclüdür. Zəngilanlı mahir muğam bilicisi Asif Bağırov bu barədə belə deyir.

-Zülfü Adığözəlovun oxuduğu mahnı «Rast» və ya «Mahur» muğamları üstə oxumaq mümkündür. Nəriman müəllimin yazdığı şeirə bəstələnən mahnı isə «Zabul» mayesi üzrə oxunur. Sanki işıqlığa, xöş günlərə səsləyir bizi. Burada Bəxtiyar Vahabzadəni (1925-2008) də bir yada salaq. Görək o nə deyir:

«Nə deyir könlümü oymaqla Segah?» Nə deyir könlümü oymaqla, oyulmaqla Segah? Gözə göz yaşları tək bir belə dolmaqla Segah? Könül hıçqırtısı, qəlb atəşi, can yanğısıdır. Sən mənim göz yaşım ol, çağla, Segah, çağla, Segah. Anamın öz südü tək sən halalımsan, halalım, Nə deyirsən, məni məndən belə almaqla Segah? Bizi dünyanın o dar çərçivəsindən çıxarır, Dəli xallardakı

hönkürtüyə dalmaqla Segah. Onun hər pərdəsi ah, hər bəmi qəm, hər zili od, Qəlbə atəş çiləyir, hökm eləyir ağla, Segah. Bəxtiyarın da könül telləri titrər beləcə. Deyər ahəstəcə hey. «Ağla, Segah, ağla Segah».

## Bağırov Tapdıq Baxşəli oğlu

*«Sənin Zəngilan» mahnısınınn bəstəkarı*
*Zəngilan musiqi məktəbinin ilk direktoru,*



Bağırov Tapdıq 1940-cı ildə Naxçıvanda anadan olub. Orta və ilk musiqi təhsilini Naxçıvan şəhərində alıb. Sonra Bakıya gələrək sənədlərini A.Zeynallı adına musiqi məktəbinə verir. Dörd illk təhsilidən sonra onu təyinatla Zəngilana musiqi məktəbinə direktor yollamışlar. O, rayonda yeni məktəbin açılması üçün müəyyən çətinliklərlə üzləşsə də sonda məktəbin açılmasına nail olub. Tapdıq müəllim bu dörvrdə Zəngilanlı müəllim N.Əliyevin xüsusi olaraq mahnı üçün yazdığı şeirə musiqi bəstəyir. Bu ilk yerli bir mahnı idi. O illərdə uşaqdan böyüyə hamı bu mahnını oxuyurdu. Bu mahnı uzun illər ərzində repertuardan düşmədi. Rayon miqyaslı elə bir tədbir olmazdı ki, o, ifa edilməsin. Mahnının ilk ifaçısı isə Məleykə Həsənxan qızı Azadova olmuşdur Sonrakı, ildə Tapdıq müəllim Bakı şəhərinə dönmüşdür. Əldə olan məlumata görə o sonra Azərbaycan Dövlət Konservatoriyasını bitirmişdir.

## ƏLİYEV Nəriman Salman oğlu



Əliyev Nəriman Salman oğlu 1925-ci ildə rayonun Tiri kəndində anadan olub. Azərbaycan Dövlət Pedaqoji İnstitutunun Filologiya fakültəsini bitirib.. Uzun illər şəhər orta məktəbində müəllim, direktor işləyib. Filologiya elmləri namizədidir. Zəngilan rayonunda 1963-cü ildən yayıma başlayan «Kənd həyatı» qəzetində müntəzəm olaraq şeirləri, satiraları ilə çıxış etmişdir. O bir neçə kitabın müəlifidir.

Əliyev Nəriman 2007-ci ildə Bakıda vəfat etmişdir. Həyat yoldaşı Sayılova Əntiqə İsfəndiyar qızıdı. 3 qızı, 3 oğlu olub.

**Sənin Zəngilan**

Nə gözəlsən ey vətən,
Qoynun bağça, bağ, gülşən,
Ömür gözəl, həyat şən,

Nəqarət: Sərin bulaq, göy meşə,
Lalə, nərgiz, bənövşə,
Bəzəyindir həmişə,
Sənin Zəngilan,
Gəlsə neçə qonağın,
Leşkər, Kinav bulağın,
Açır geniş qucağın ,

Nəqarət: Sərin bulaq, göy meşə,
Lalə, nərgiz, bənövşə,
Bəzəyindir həmişə,
Sənin Zəngilan.

## Məhərrəm (Quliyev Məhərrəm Rzaqulu oğlu) MAHİ



Məhərrəm Mahi 1924-cü ildə Zəngilan rayonunun Quyudərə Xəştab kəndində anadan olub. Gilətağ 7 illik və Xocahan orta məktəbini bitirib. Həmin il ehtiyac olduğu üçün oxuduğu orta məktəbdə dil-ədəbiyyat müəllimi təyin edilib. 1952-ci ildə ali məktəbi bitirib. Qubadlı və Zəngilan rayonlarında müəllim, direktor müavini, direktor və təhsil şöbəsində inspektor işləyib.

1963-cü ildən nəşr olunan «Kənd həyatı» qəzetinin şeir şöbəsinə, «Kəlbətin» satirik guşəsinə və «Süsənin səsi» ədəbi birliyinə rəhbərlik edib. O bir neçə kitabın müəlifidir. Rayonun işğalından sonra Bakı şəhərində vəfat edib.

**Zəngilanım bəs eylər**

Sən gözəllik çələngisən, a yurdum,
Eşqin ürəyimdə min həvəs eylər,
Yaxşıların hər əməli yaxşıdır,
Nəhs adamlar baxsa sənə nəhs eylər.

İnsanlığın özündədir xeyir, şər,
Mən demirəm, məndən əvvəl demişlər,
Bir müdrik min kamala nur verər,
Bir divanə könüllərə yas eylər.

Bəxtin gülsə mənsəb keçsə əlinə,
Uyma kəmfürsətin fitnə-felinə,
İşi düşsə şəkər qatar dilinə,
Dalda da, kimsə bilməz nəhs, eylər.

Yoxdu bu dünyada gözüm, nə danım,
Odlu sinəmdədir dağım, aranım,
Mənə öyünməyə Azərbaycanım,
Vəsf etməyə Zəngilanım bəs eylər. 14.08.1982.

**Azərbaycan elimdi, dili mənə şirindi. Bakı. 2003.s.42**

**Zəngilandadır.**

Dostum, gəl dolaşaq bu doğma yurdu,
Elin xoş baharı Zəngilandadır.
Həcər dəyanəti, Nəbi qeyrəti,
Koroğlu Nigarı Zəngilandadır.

Dünyanın ən böyük çinar meşəsi,
Hər çinar dibində könül nəşəsi,
Turac pırıltısı, qırqovul səsi,
Kəkliyin xumarı Zəngilandadır.

Əsgülüm dağında oyansan səhər,
Səni məst eləyər tər bənövşələr,
Nəcəflər, Dərəli dilbər guşələr,
Çayların axarı Zəngilandadır.

Barlı-bərəkətli Ağ Oyuq düzü,
Atalar hikməti Şıx Məmməd düzü,
Elin iftixarı, şahı-şahbazı,
Sayılov vüqarı Zəngilandadır.

Qədim məskənidir Şəhri-Şərifan,
Min illik tarixdən o verir nişan,
Ötən əsrlərdən yadigar qalan,
Babəkin hasarı Zəngilandadır.

Dumanlı-çənlidir uca dağları,
Dərdlərə dərmandı buz bulaqları,
Silən qəlbimizdən qəmi-qubarı,
Şəfa qaynaqları Zəngilandadır.

Durur zirvəsində qartal Süsənin,
Hürküşür qoynunda maral Süsənin,
Baxıram aparır xəyal, Süsənin,
Səngər qayaları Zəngilandadır.

Mətləbim-məramım sözümün canı,
Mahiyəm, deyirəm qəlbim duyanı,
Əgər dolaşsanız Azərbaycanı,
Gözəllik diyarı Zəngilandadır.

## HACIYEV Tofiq Rzaqulu oğlu



Hacıyev Tofiq Rzaqulu oğlu 26 avqust 1932-ci ildə Rayonun Qıraq Müşlan kəndində anadan olub. 1954-cü ildə ikiillk Naxçıvan Pedaqoji İnstitutunu bitirib. Rayonun işğalına kimi 1 saylı şəhər otrta məktəbində müəllim işləyib. 1972-ci ildə rayon qiyabi orta məktəbin direktoru olub. Rayonun işğalından sonra Bakıda 284 saylı orta məktəbdə müəllim kimi fəaliyyətini davam etdirib. Tofiq Rzaqulu oğlu 16 aprel 2016-cı ildə Bakıda vəfat etmişdir.

**Zəngilanı görəcəm.?!**

Gördüklərim xatirə tək qalıbdır,
El-obamı yağı düşmən alıbdır,
Vətənimi qaçqın hala salıbdır,
İnanmıram görməsəm mən öləcəm!
Görən bir də Zəngilanı görəcəm?!

Gördüklərim elə bil ki, yoxumuş,
Zəmanənin əməlləri çoxumuş,
Vətən sözü ürəyə bir oxumuş,
Vətənimdə vətənsiz can verəcəm,
Görən bir də Zəngilanı görəcəm?!

Ürəyim istəyir görəm vətəni,
Yaşıl çöllərini, daşı, dərəni,
Viranəyə dönmüş yetim vətəni,
Vətən deyə-deyə fəryad edəcəm!
Görən bir də Zəngilanı görəcəm?!
**Gecikmiş şeirlər. B. 2011. s. 156.**

## Ələkbərli Oqtay İskəndər oğlu (Oqtay ZƏNGİLANLI)



Ələkbərli Oqtay İsgəndər oğlu 1939-cu ildə Zəngilan rayonun Vejnəli kəndində anadan olmuşdur. 1962-ci ildə BDU-nun Geoloji-coğrafiya fakultəsini bitirib. 2000-ci ildən AYB-nin üzvüdür. «Dağlar üz döndərib məndən», «Bir tənhalıq axtarıram», «Çəkir öz dərdini özündə dünya», «İç dünyama səyahət», «Zəngilanın

tarixi, coğrafiyası iqtisadiyyatı» (həm müəllif), «Adını tarixləşdirən şəxsiyyət», «Mincivan: sirli-soraqlı dünyamız» (həmmüəllif) kimi kitabların müəlifidir. «Qızıl qələm» media mükafatı laueratıdır. Qarabağ müharibəsi və əmək veteranıdır. Ailəlidir, 4 oğul, 1 qız atasıdır. Nəvələri var.

**Zəngilan həsrəti**

Bağlanıbdı könül sənə,
Ürək səni ata bilmir.
Əl uzatdım dönə-dönə,
Əlim sənə çata bilmir.

Hansı namərd qurdu tələ?
Pərən düşdün eldən-elə.
Varlığını bilə-bilə,
Əlim sənə çata bilmir.

Xəyallarım səninlədir,
Qibləm, yönüm-yönünlədir.
Hüsnüm, gözüm önündədir,
Əlim sənə çata bilmir.

Qalxam bir də Şükrataza,
Baxam ordan xan Araza.
Yuxularda aza-aza,
Əlim sənə çata bilmir.

Oyan seyid Həsən ağa,
Gəlim o pak nur ocağa.
Həsrət məni boğa-boğa,
Əlim sənə çata bilmir.

Səslə məni, Zəngilanım,
Yox evimə zəng çalanım.
Sənsiz harda daldalanım,
Əlim sənə çata bilmir.

Pəncərəmi vurub külək,
Qollarımı qırıb fələk.
Dolanıram bir dəli tək,
Əlim sənə çata bilmir.

Böyümüşdüm qucağında,
İsinmişdim ocağında.
Ömrün ötən bu çağında,
Əlim sənə çata bilmir.

Həsrətli qar sazağıyam,
Hicran yolun uzağıyam.
Bir sənsizlik dustağıyam,
Əlim sənə çata bilmir.

Oqtayam, bir sərv et məni,
Ocağında sərf et məni.
Bir gün ölsəm əfv et məni,
Əlim sənə çata bilmir.

**Çəkir öz dərdini özündə dünya. Bakı. 2009. S.11.**

## Telman Əziz oğlu MƏMMƏDOV



Məmmədov Telman Əziz oğlu 1939-cu ilin iyun ayında Zəngilan rayonunun Muğanlı kəndində anadan olub. Gilətağ kənd orta məktəbini, 1962-ci ildə isə Zəngilan qəsəbəsində açılan birillik pedaqoji kursu bitirib. 1963-cü ildə Aladin 7 illik məktəbində ibtidai sinif müəllimi təyin olunub. 1966-cı ildə Vənətli kənd orta məktəbində təlim-tərbiyə üzrə direktor müavini, 1979-1993-cü illərdə direktor işləyib. Telman Əziz oğlu 1988-ci ildə ADU-nin filologiya fakültəsini qiyabi bitirib. O bədii yaradıcılığa şerlə başlasa da sonra nəsrə üstünlük verib. 1993-cü ildə rayonun işğalından sonra da respublika mətbuatında mütamadi çıxış etmişdir. O bir neçə kitabın müəllifidir.

**İtirmişəm.**

Mənə tənə edən qafil,
Vətənimi itirmişəm,
Namusumu, qeyrətimi,
Sərvətimi itirmişəm.

Meşələri cənnət olan,
Tarixlərdə adı qalan,
Kəhkəşanı viran olan,
Zəngilanı itirmişəm.

**Həsrətdən yanan ürək. Bakı. 2014. S.**

## Sahib Allahverdi oğlu CAVAD ZƏNGİLANLI



Sahib Allahverdi oğlu Cavadlı 01 oktyabr 1943-cü ildə Pirçivan kəndində anadan olub. İxtisasca neftçidir. Uzun müddət SSRİ Neft Qaz Sənayesi Nazirliyində çalışıb. 1976-cı ildən ixtisaslaşdırılmış sahədə açıq neft və qaz fantanlarının profilaktikası və ləğvi üzrə tağım komandiri, böyük sahə mühəndisi kimi

çalışıb. Bu sahədəki xidmətələrinə görə «Şərəf Nişanı» ordeni ilə təltif olunub. Bədahətən şer demək qabiliyyətinə malik olan Sabib Savadlının şerləri qəzet və jurnallarda çap olubub. 2006-cı ildən təqaüddə olan Sahib Allahverdi oğlu Cavadlı 01 dekabr 2020-ci ildə vəfat etmişdir.

**Zəngilanım**

Sənsizlikdən günüm qara,
Həsrət çəkib məni dara,
Əlac olsa intizara,
Könlüm olar quş qanadlı,
Qaynar qanım Zəngilanım.

Vardı səndə xoş çağlarım,
Laləzardı yaylaqlarım,
Kinov, Leşkər bulaqlarım,
Suyundu bal, bəhməz dadlı,
Məlhəm sanım, Zəngilanım.

Gənc yaşımdan qaldım yetim,
Oğlu oldum bu millətin,
Yollar keçdim cəsur, mətin,
Şərəfimdir Şərəf adlı
Döş nişanım Zəngilanım.

Neynim, səndən ayrı düşdüm,
Yarı sağam, yarı düşkün,
Gəlməz bir də ötən xoş gün
Gəlməz Sahib ahıl, illər atlı,
Yox zamanım, Zəngilanım
Ruhum, canım Zəngilanım.

**Sahib, Salam, Mahir. 2019. Bakı. Qardaşlar. s.1.**

## CAVADLI Salam Allahverdi oğlu



Cavadlı Salam Allahverdi oğlu 1950-cı ildə Pirçivan kəndində (indiki Zəngilan şəhəri) anadan olub. Zəngilan şəhər orta məktəbini sonra isə indiki Y.Məmədəliyev adına Naxçıvan Dövlət Universitetinin tarix fakültəsini bitirib. Salam müəllim sonra Jurnalist Sənətkarlığı İnstitutunu da bitirib. 1970-ci ilin noyabrından Zəngilan rayonunda nəşr olunan «Kənd həyatı» qəzetində jurnalist kimi əmək fəaliyyətinə başlayıb. Rayonun işğalından sonra Salam müəllim

rayon qəzetinin redaktoru kimi qəzetin işıq üzü görməsində çox əmək sərf etmişdir.

O 50 ildən artıq dövr ərzində zəngin bir yaradıcılıq yolu keçmişdir. Uzun müddətdir ki, rayonda nəşr olunan «Kənd həyatı» (İndi «Zəngilanın səsi») qəzetində əməkdaşlıq etmişdir. Hazırda həmin qəzetin redaktorudur.

Azərbaycan Yazıçılar birliyinin, Azərbaycan Jurnalistlər birliyinin üzvü, Həsən bəy Zərdabi adına mükafat laueratıdır. Qaçqın və Məcburi köçkün mövzularında mətbuatdakı xidmətlərinə görə Azərbaycan Mətbuat Şurasının və Dövlətqaçkınkomun diplomuna və pul mükafatına, eləcə də onlarla digər təltiflərə layiq görülüb.

Salam Cavadlı çox illik ədəbi bədii fəaliyyətinə görə «Tərəqqi» medalı ilə də təltif olunub.

«Gəl Novruzum» pyesi 100 dəfədən çox Azərbaycan Dövlət Akademik Milli DramTeaтrında tamaşaya qoyulub. O bu mötəbər teartda əsəri tamaşaya qoyulan ilk Zəngilanlı şair-dramaturqdur. O «Qayanın tənha daşı», «Ağ yağış», adlı şeirlər, «Son gümanın Zəngilanım», «Müqəddəs ruhları sızladan 20 il», «Pyeslər», «Qardaşlar» (həmmüəllif), «Ölməzlik haqqı qazanan oğullar» kitablarının müəllifidir.

Burada Salam müəllimin şerlərindən bir neçə nümunə veririk.

## ZƏNGİLANIM

İncin çinar meşəsidi,
Seyr, sehr güşəsidi,
Yolum sənə düşəsidi,
Birim, pirim, din-imanım!

«Koroğlu daşı»n uludu
Sevdiyim Ləşkər yoludu
Süsəndə öpdüm buludu
«Ağ oyuq» da coşdu qanım.

Ülfətindən yorulmadım,
Çox yurd gəzdim vurulmadım,
Bəsitçaysız durulmadım,
Oxçusuz necə dayanım?

Dağüstü park tacdı mənə
Çoxu könlün açdı mənə
Yenə ruhum qaçdı sənə
Barlı-bəhərli məkanım.

İnciməsin ellər məndən
Ən ətirli güllər məndən
Yalnız məni eylər məndən
Qoynu cənnət Zəngilanım.
Son gümanım Zəngilanım.

**s.386. S.Cavadlı. «Son gümanım Zəngilanım», «Avropa» nəşriyyatı, Bakı 2011. 408 s.**

## ZƏNGİLAN

Hanı o xöşbəxt çağım?
Olmusan sinə dağım,
Doğma, gözəl oylağım,
Xanimanım Zəngilan.

Saysızdır cənnət güşən,
Məst oldu yolu düşən,
Dörd çay axıb görüşən,
Gülüstanım Zəngilan.

Oyun qurmuşdu fələk,
Meydanda qalmışdın tək,
Dözdün son gümanadək
Son gümanım Zəngilan.

Röyada gördüm səni,
Artdı saçımın dəni,
Hey çağırırdın məni,
Tək qalanım Zəngilan.
İnanıram, bir gün mən,

Öpəcəyən əlindən,
Çiçəyindən, gülündən,
Mehribanım Zəngilan.
Sahib, Salam, Mahir.

**s.391. S.Cavadlı. «Son gümanım Zəngilanım», «Avropa» nəşriyyatı , Bakı 2011.408 s.**

## Vaqif QÜDRƏT ZƏNGİLANLI



Vaqif Qüdrət Zəngilanlı 1945-ci ildə Zəngilan rayonunun Alıbəyli kəndində anadan olmuşdur. Alıbəyli kənd orta məktəbini bitirdikdən sonra Azərbaycan Dövlət Universitetinin Filologiya fakültəsinə daxil olmuş və oranı 1972-ci ildə  bitirmişdir. Rayonun işğalından sonra Bakı şəhərində məskunlaşıb.

Vaqif müəllim bir neçə şerlər kitabının müəllifidir. Vaqif Qüdrət 2019-cu ildə vəfat etmişdir. Şerlərindən bir mümunə

**Zəngilanım.**

Əsgülümdən daha yellər əsməyir,
Gözlər gözüm gözləməkdən bezməyir,
Ürək səndən ümidini üzməyir,
Ana yurdum, son gümanım vətənim,
Zəngilanım, Zəngilanım, vətənim.

O dağların dağ-dağ oldu gözümdə,
O yaxınım uzaq oldu gözümdə,
Ağlar gözlü bulaq oldu gözüm də,
Ana yurdum, son gümanım vətənim,
Zəngilanım, Zəngilanım, vətənim.

Ay çinar meşəsi, səni itirdim,
Gözümün yaşıyla çinar bitirdim,
Sənsiz sağalarmı sənsizlik dərdim?
Ana yurdum, son gümanım vətənim,
Zəngilanım, Zəngilanım, vətənim.

Gün olar ki, yuxularım çin olar,
Gülə-gülə el yurduna yön alar,
Ağlar gələn ellər dönər gül olar,
Ana yurdum, son gümanım vətənim,
Zəngilanım, Zəngilanım, vətənim.

**Vaqif Qüdrət. Bir ömür həsrət. 2002. s. 109-110**

## Həsən ORUCOĞLU



Həsən Orucoğlu (Quliyev Həsən Oruc oğlu) 1954-cü ildə rayonun Məmmədbəyli kəndində anadan olub. Gəncə Dövlət Pedaqoji İnstitutunun fizika fakültəsini bitirib. Uzun illər rayonda müəllimlik etmişdir. Rayon «Kənd həyatı» qəzetində fəaliyyət göstərən «Pöhrə» ədəbi birliyinə rəhbərlik edib.

Həsən Orucoğlu 25 yanvar 2024-cü ildə vəfat etmişdir.

### Həzin bir mahnı mətni

Bəsimdir özümə çiçəyim, gülüm
Süsəndə oxusun təki bülbülüm,
Çinarım, bulağım, məğrur Əsgülüm
Yolumu gözləyir, gözüm səyriyir
Mənim könlüm Zəngilanı istəyir

Gözümdə, könlümdə əridi kədər,
Duyan tapılarmı məni bu qədər,
Demərəm bir daha yaşamaq hədər
Qəribəm, qəlbimə adı söz dəyir
Mənim könlüm Zəngilanı istəyir

Nəqarət: Xan Araz, Həkəri, Bəsit, Oxçuçay
Dalğalı səsiylə qoparar haray,
Mən özgə yerlərdə tikmərəm saray
Kimin könlü nə istəyir istəsin,
Mənim könlüm Zəngilanı istəyir

Büdrədim, qoluma sən girən oldun,
Çağırdım, hayıma hay verən oldun,
Ayağım altına yol sərən oldun,
Təpədən dırnağa canım da deyir,
Mənim könlüm Zəngilanı istəyir

## CAVADLI Mahir Allahverdi oğlu



Cavadlı Mahir Allahverdi oğlu 17 fevral 1957-ci ildə Zəngilan qəsəbəsində anadan olub. Zəngilan şəhər orta məktəbini sonra isə ADU-nun Jurnalistika fakültəsini bitirib. Orta məktəb illərindən şer və məqalələri rayonda nəşr olunan «Kənd Həyatı» qəzetində çap olunub. O «Azad Azərbaycan», «Abşeron» «Yeni Fikir», «Fəryad», «Sərhəd», (məsul katib) qəzetlərində işləyib. O ilk hərbi jurnalistlərimizdən biridir. Çox sayda kitablara redaktorluq edən Mahir Cavadlı bir neçə kitabın da müəllifidir. O MTN-nin ehtiyatda olan polkovnikidir.

M. Cavadlı deyir: Bu kitabın əslində 2009-cu ilin fevral ayının 27-nə, 50 illik yubileyimə işiq üzü görməsi nəzərdə tutulmuşdu.

Və bu kitabı hamıdan çox görmək hər sətrini hecalaya-hecalaya oxumaq arzusunda olan anama söz vermişdim ki, adda-budda eşidib bəyəndiyi şeirlərimi toplayıb kitab halına salacağam. Ancaq.... 2008-ci ilin noyabrında anamın başdaşına onun öz adından bir bənd şer yazmalı oldum.

Oğullar böyütdüm, bəhrəsin gördüm,
Tanrı, haqq yolunu seçdim dünyada,
Sonu xoş yuxulu bir ömür sürdüm,
Demirəm zamansız köçdüm dünyadan,
Heyf, Zəngilansız köçdüm dünyadan.

Zəifdir, güclüdür, deyə bilmərəm, amma bu beşcə misrada anamın özü var, onun həyatı, amalı, arzusu, «tanrı məni əzabsız öldür» diləyinin ifadəsi əks olunub.

**Bir ovuc vətən torpağı. Bakı. 2010.**

## HACIYEV Elşad Tofiq oğlu



Hacıyev Elşad Tofiq oğlu 08 noyabr 1963-cü ildə Zəngilan qəsəbəsində ziyalı ailəsində anadan olub. 1970-1980-ci illərdə şəhər orta məktəbində oxuyub. Atası Tofiq Hacıyev rayonun işğalına kimi həmin məktəbdə ədəbiyyat fənnindən dərs demişdir. Elşada da ədəbiyyata həvəsi atası yaradıb.

Burada Elşad Hacıyevin Zəngilanla bağlı bir şeirini sizlərə təqdim edirəm.

**Zəngilanda**

Soruşma ay oğul, nə deyim,
Bu dünya yalansa, düzündən harda?
Soruş vətənimdən elimdən deyim,
Qızıl Zəngilanın özündən harda.

Bartaz dağlarından Araz boyunca,
Nə vaxtsa seyr etsən, oğul doyunca,
Yamacda lalələr, düzəndə yonca,
Söylə bu yerlərin yazından harda.

Torpağı özümüz etməsək azad,
O viran yurdunu kim eylər azad,

Məlikli, Müşülan, Üdgün, Turabad,
Mincivan oğlundan, qızından harda?

Bəsit vadisində Kollu, Rəzdərə,
Baharlı, Ördəkli, ta Çöpədərə,
Görünər çinarlı gözəl mənzərə,
Bəsitin Araza nazından harda?!

Cənnət bir güşəsi Dardan yuxarı,
Şayıflı, Bürünlü, gözəli Canbarı,
Gəzsən Nəcəfləri, içsən Leşkarı,
Bilərsən əliyin izindən harda.

Dalıb Kirdəzirdən qalx Əsgülümə,
Görsən iki qönçədir, dəymə gülümə
Alagöz axtarsan, ömür gününə,
Keçikli gözəlin gözündən harda.

Ağalı, Hacallı qarpız ləzzətli,
Genlik, Malatkeşin, Tağlı, Vənətli,
Camaat baməzə, sözlü söhbətli,
İndi o sözlərin düzündən harda.

Hər daşı bir tarix Məmmədbəylinin
Sarılın, Rəbənin, Alıbəylinin,
Canına can verən o boz çöllərin,
Yayda Həkərinin buzundan harda?

Xoş müjdə eşitsən ziyafət eylə.
Oğul badə qaldır, şəfaət eylə
Çəkinmə adından Xitabət eylə
Kim sorsa Elşadın sözündən harda? 2017.

**Elşad Hacıyev. İkili dünya. Bakı 2018. *****

P.S. Elşən Hacıyev rayonun bütün kəndlərini sadalamış nədənsə Sobu kimi bir incini unutmuşdur.

## İBADOV Eyvaz Baloğlan oğlu



İbadov Eyvaz Baloğlan oğlu 1955-ci ildə Pirçivan kəndində anadan olub. 1973-cü ildə Zəngilan şəhər orta məktəbini bitirib. Orta məktəbi bitirdikdən sonra V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstutuda daxil olub və oranı bitirib. Ali məktəbi bitirdikdən sonra orta məktəblərdə dərs deyən Eyvaz müəllim rayonun işğalından sonra Şirvan şəhərində məskunlaşmış və orada uzun illər məktəb direktoru işləmişdir. Bədii ədəbiyyata maraq göstərən Eyvaz Baloğlan oğlunun bir şer nümunəsini sizlərə təqdim edirəm. Ailəlidir bir qızı, bir oğlu var.

**Ana, könlüm Zəngilanı istəyir.**

O yerlərin ili ildən xoş gələr
Alça, ərik, zoğal lap tez çiçəklər
Meşələrdən qar örtüyü çəkilər?
Yəqin indi yaz özünü göstərir...
Ana, könlüm Zəngilanı istəyir!

«Dağüstü park» cənnət olur elə bil
Danaqıran, qızıl lalə, qərənfil...
Bu yerlərdə tez açardı qızılgül
Bənövşələr kol dibindən dikəlir
Ana, könlüm Zəngilanı istəyir!

Yaz gələndə sel suları çoxalar
Dörd bir yana meşələrə səs salar
Qar altından qarçiçəyi boylanar
Dərələr də şaqqıldayır-kişnəyir
Ana, könlüm Zəngilanı istəyir!

Boz sərçələr nə edirlər - biləsən
Anadili oxuya - sən güləsən
Sığırçınlar qayıdıbmı görəsən?
Qaranquşlar yuva qurmaq istəyir?...
Ana, könlüm Zəngilanı istəyir!

Neçə ildir gör qapısı bağlanıb
Gələni yox, gedəni yox - karıxıb
İndi o da bizim üçün darıxıb
Ev-eşik də qonaq -qara gözləyir
Ana, könlüm Zəngilanı istəyir!

Qonum-qonşu cəm olaydı bir yerə
Çərşənbənin gecəsi bir mərəkə
Papaq atan, kosa oynadan - məzhəkə
Nə olardı hər küçədə - kim bilir?
Ana, könlüm Zəngilanı istəyir!

Yolun düşə bir gün «Dardanyuxarı»
Bu yerlərin ürəyidir Şayıflı
Neçə oba, neçə kənddir - sayımmı?
Ruhum ancaq bu yerlərdə dincəlir
Ana, könlüm Zəngilıam istəyir!

Birnəfəsə «Sarı yala» qalxasan
Usubların üstündə bir durasan
Gözdolusu boylanasan-baxasan
Səda düşə Nəcəflərə: «Kim gəlir?»
Ana, könlüm Zəngilanı istəyir!

Xəbər tuta gəlişindən Altınlı
Haça qaya, Yalbiçənək, Fındıqlı...
Leşgər, Həsrət, Metçeşməsi, Batdaqlı...
Baş çəkəsən bulaqlara birbəbir
Ana, könlüm Zəngilanı istəyir

Ömür keçdi qürbət eldə-obada
Dağ da olsa dözə bilməz bu oda
Tale yazan nə pis yazdı yazanda
Eyvaz daim «Vətən» deyib inləyir.
Ana, könlüm Zəngilanı istəyir....
**Ana, könlüm Zəngilanı istəyir. Eyvaz İbadov**

**«Sənin Zəngilan» mahnısı:**

Sözləri: Nəriman Əliyevin
Musiqisi: Tapdıq Bağırovun
İlk ifaçısı: Məleykə Azadova

## AZADOVA Məleykə Həsənxan qızı
***«Sənin Zəngilan» mahnısının ilk ifaçısı***



Azadova Məleykə Həsənxan qızı 1 dekabr 1948-ci ildə Zəngilan rayonunun Ağbis kəndində anadan olmuşdur. 1966-cı ildə Zəngilan qəsəbə orta məktəbini bitirmiş və həmin il S.M.Kirov adına Azərbaycan Dövlət Universitetinin (indiki Bakı Dövlət Universiteti) Mexanika riyaziyyat fakültəsinə qəbul olunmuşdur. 1971-ci ildə Universiteti riyaziyyatçı hesablayıcı, riyaziyyat müəllimi ixtisası ilə bitirmişdir. 1971-ci ilin avqust ayından 1972-ci ilin mart ayına kimi təyinatla SSRİ MSİ, Mərkəzi Texnoloji Layihələndirmə Bürosunun Azərbaycan filialında mühəndis vəzifəsində çalışmışdır. 1972-ci ilin martından Zəngilan rayon MHS-da böyük layihəçi mühəndis vəzifəsində işləmiş, 1972-ci ilin may ayından Zəngilan şəhər orta məktəbinə riyaziyyat müəllimi vəzifəsinə təyin olunmuşdur. 1973-cü ilin sentyabr ayından 1982-ci ilin iyul ayına qədər Azərbaycan SSR EA Kİ-nun AİS şöbəsində böyük riyaziyyatçı proqramçı vəzifələrində işləyib. 1978-ci ildən etibarən Azərbaycan Dövlət Xalq Təsərrüfatı İnstitutunun (indiki İqtisad Universiteti) İHM-də aparıcı proqramçı vəzifəsində çalışmışdır. 2001-ci ildən eyni zamanda həmin universitetin müxtəlif kafedralarında saathesabı müəllim işləyib.. 2007-ci ilin oktyabr ayının 1-dən İqtisad Universitetinin «İqtisadi informasiya sistemləri və texnologiyaları» kafedrasına müəllim təyin olunmuşdur. UNEC-in «İnformasiya iqtisadiyyatı və texnologiyaları» kafedrasında müəllim vəzifəsində çalışıb. Hazırda «Rəqəmsal texnologiyalar və tətbiqi informatika» kafedrasının baş müəllimidir. 2 dərs vəsaiti, 1 fənn proqramı, 8 elmi məqalənin müəllifidir. Ailəlidir, üç övladı var.




**Zəngilan şəhərinin məktəb məhəlləsi**


Hüseyn


Telli


Eldar


Mürvət


Hidayət


Əzət


Aydın


Gülşən


Dilarə


Nəniş


Qasım


Rüqiyyə


Aidə


Həmid


Diliş


Yusif


Nigar


Fehruz


Gülüzar


Səfiyar


Püstə


Vaqif


Xalidə


Seyfulla


Şüşə


Mənsimə


Kərim


Mələk


Heydərqulu


Zeynəb


Ağa


Ərəstun


Seymur


Bəylər


Zəhra


Əli


Bənövşə


Həsən


Əliş


Məleykə


Azər


Allahverən


Sabir


Məhəmməd


Fatma


Tofiq


Aidə


İsmayıl


Mirvari


Əziz


Gümüş


İsa


Şəfa


Şamxal


Bəyim


Sərdar


Muradxan


Dilbər


Asif


Soltan


Əli


Niftalı


Sona


Nadir


Qəmər


Qurban


Şərqiyyə


Şamı


Şəfiqə


Heydər


Bayram


Orxan


Tarıyel


İdris


Yaqub


Xədicə


Vahid


Yusif


Şahzaman


Əmiraslan


Elnur


Əhməd


Nəzir


Bəxtiyar


Tapdıq


Nəriman


Məhərrəm


Tofiq


Oqtay


Telman


Sahib


Salam


Vaqif


Həsən


Mahir


Elşad


Eyvaz


Məleykə

## İbrahimov Ayaz Cənnət oğlu

İbrahimov Ayaz Cənnət oğlu 24 noyabr 2021-ci ildə Hollandiyada anadan olub. Altı aylıq olanda bəd xassəli şiş xəstəliyinə tutulmuşdur. Uzun sürən xəstəlikdən sonra 29 oktyabr 2023-cü ildə dünyasını dəyişmişdir. Allah rəhmət eləsin.





**Şəkildə soldan sağa: Balaxanım Əli qızı, Qənfilə Paşayeva, Zenfira Orucova, Kəklik İzzət qızı, Lətifə Həşimova, Gülşən Qocayeva, Səlbi Alməmmədova, Maya Qurbanova Nigar Əliyeva*, Nailə Həsən qızı, Roza Nəbiyeva, Rafiq Heydərov, Xanoğlon Talıbov*, Mobil İsmayılov, Sücəddin həkim, arxadakı Rəhim İmaməliyev, Yusif Hacıyev, Əziz Əhmədov, Abdulla Əliyev, Vaqif Babayev, Novruz Məmmədov*, Nəriman Muxtarov, Bəbir Məmmədov, Azad Qocayev, Fazil Təhməzov, Paşa Hüseynov. Burada 7 məhəlləli var.*Vəfat edənlər**



**Şəkildə soldan sağa M.Heydərov (yanında Tofiq, Bəxtiyar, Rafiq), Fatma xala (yanında Yusif, İlqar) və övladları. Burada Firəngiz xanım yoxdu.**



**Şəkildə soldan sağa: Hacıyev Şahin Tofiq o*, Əliyev Nadir Əli o, Mehtiyev Məmməd Bəhlul o*,Güldəstə xanım, Ağayev Aqil Səhiyəddin o (məruzəçi), Kərimov Şirvan Mürvət o (məruzə qəbul edən), Xəlilov İlqar Xəlil o*(görünməyən qızdı), Rauf, Almaz xanım Gəncədən, Məmmədov Müşfiq Zülfüqar o. 1981. Şəhər stadionu. *vəfat edənlər**



**Hacı Əli Sobulu 30 ildən sonra vətən torpağını ziyarət elədi. 2023.**




**Zəngilan şəhərinə daxil olan kəndlərin sxemi**

**Səhifə 13-dəki şəkilin alt yazısı.** **Şəkildə soldan sağa: Camalov Telman Cümşüd o, İbrahimov Saleh Xəlil o, Alsanov Abasqulu Yusif o, Allahverdiyev Yavər Firudin o, Quliyev Tahir İsmayıl o, Hüseynov Məhəmməd Abbas o, Haqverdiyev Nazim İsa o, Hacıyev İbrahim Tofiq o*, Mustafayev Tariyel Mansur o*, Babayev Mehman Nəriman o*, 2-ci cərgədə Qurbanova Tərlan Xanlar q, Səttərova İradə Əli q, Bədəlova Güldənə Oruc q, Bağırova Mətanət Məhəmməd q, Bədirov Davud Seyfulla o, Kərimova Məhruzə Sabir q, Əliyev Mustafa Qurban o, Namazov Xalid Bəxtiyar o, Məmmədova Rəbiyyə İzzət q, Orucov Rauf Musa o, Məmmədova Tünzalə Əbülfəz q, Rzayev Yusif Məhərrəm o, Salahova Şölə Zülfüqar q, Vəliyeva Şahnisə Şəmil q, Abasova Tovuz Abbas q, Bayramova Mahirə Həsənqulu q, oturanlar Vəliyeva Südabə Qasım q, Qənbərova Məlahət, Quliyeva Ramilə Müslüm q, Əkbərova Rəfiqə İsa q, Fərəcova Nailə Əkbər q (müəllimə), Əliyeva Tərlan Nəriman q, İsmayılova Pərvanə Cəlal q, Şərifova Roza Fətullah q, Əsədova Aygün Rəsul q.*Vəfat edənlər. Adları qrmızı ilə yazılanlar məhəllə sakinləridi**



**Şəkildə soldan sağa: Oturanlar Fərux Qəhrəmanov, Rəşid Yusifov (məhəllə sakini), Həsən Axundov(məhəllə sakini), İdris Şıxəliyev. Arxada Famil Abdullayev, Allahverdi Malatkeşinli və Qurban Əliyev(məhəllə sakini).**

# HACI ƏLİ AYAZ SOBULU

(Cümşüdlü Əli Seyfulla oğlu)



Cümşüdlü Əli Seyfulla oğlu 20 Sentyabr 1953-cü ildə Zəngilan rayonunun Sobu kəndində anadan olub. Məktəb yaşına kimi Sobuda nənəsi Hürüxanın (anasının anası) yanında qalıb. 1961-ci ildə rayon mərkəzinə gələrək qəsəbə orta məktəbin 1 sinfinə qəbul olub. Sinif rəhbəri Lida Savalan qızı Hüseynova olub. 1964- cü ildə 4 sinfi bitirmişdir.

1965-1966-cı il tədris ilində onların oxuduğu «A» sinfini

qəsəbədə yeni açılan 8-illik məktəbə göndərmişlər. Məktəbin direktoru Həsənov Əbil Məmi oğlu idi. 1969-cu ildə 8-ci sinifi bitirdikdən sonra Naxçıvan Pedaqoji Texnikumuna sənəd versə də qəbul ola bilməyib. Həmin ilin sentyabrından şəhər orta məktəbinin 9-cu sinifinə qəbul olub. 1971-ildə orta məktəbi bitirdikdən sonra sənədlərini Azərbaycan Dövlət İncəsənət İnstitutuna vermiş və qəbul ola bilməyib. Həmin ilin sentyabrında atası ilə bərabər rayon İstehlak Cəmiyyətində fəhlə kimi işə başlayıb. 1974-1976-cı illərdə Sovet Ordusunda tikintidə iki il hərbi xidmət keçib. İki illik xidmət ərzində silah görməyib.

1977-ci ildə o vaxtkı Azərbaycan Dovlət Universitetinin (indiki BDU) tarix fakültəsinin axşam şöbəsinə daxil olub. Gündüz işləyib, axşam da oxuyub. 1983-cü ildə ali məktəbi bitirəndən sonra rayona gəlmiş və iki ilə yaxın işsiz qalmışdır. 1985-ci ilin iyun ayında rayon İcraiyyə Komitəsində işə qəbul olub. Rayon İcraiyyə Komitələri ləğv edildikdən sonra işinə İcra Hakimiyyətində davam etmişdir. Telman Kazımov rayon İcra Hakimiyyətinin başçısı təyin olunanda işdən azad edilib. Rayonun işğalından sonra Bakıda 1996-cı ilə kimi tikintidə işləyib. 1996-cı ildə tələbə dostlarının yardımı ilə onun üçün xüsusi idarə açılmış və o Əlilləri Sosial Müdafiə Fondu Zəngilan rayon şöbəsinə müdir təyin edilmişdir. O bu vəzifədə 2002-ci ilə kimi işlədi. İdarə ləğv olunandan sonra 2003-cü ildə rayon İcra Hakimiyyətində təlimatçı kimi işə qəbul olunub. 2005-ci ildə öz ərzəsi ilə işdən azad olunub.

Hacı Əli Ayaz Sobulu eyni zamanda 1988-2006-cı illərdə ictimai əsaslarla Dövlət İdarələri və İctimai Xidmət İşçiləri Həmkarlar İttifaqı Zəngilan rayon Həmkarlar İttifaqı Komitəsinin sədri olub. 2005-ci ildə Həcc ziyarətində olub. Hazırda təqaüddədir.

Onlarla elmi publisistik məqalənin və Zəngilanla bağlı 12 kitabın müəllifidir. İki oğlu, bir qızı, 3 nəvəsi var. Nəvəsi Ayaz iki yaşında dünyadan köçüb.